AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
NƏSİMİ ADINA DİLÇİLİK İNSTİTUTU

İLHAM TAHİROV

# DİALEKT LEKSİKASINDA ALINMA SÖZLƏR

**(şərq qrupu dialekt və şivələrinin materialları üzrə)**

**Bakı – «Nurlan» – 2004**

*Azərbaycan MEA Nəsimi adına*
*Dilçilik İnstitutu Elmi Şurasının*
*30 iyun 2004-cü il (protokol № 5)*
*qərarı ilə çap olunur.*

**Azərbaycan dialektologiyası – 8**



*Redaktor:* **Novruzəli Məmmədov**
filologiya elmləri namizədi

*Rəyçilər:* **Mirzə Rəhimov**
Filologiya elmləri doktoru, professor

**Fazil Əhmədov**
filologiya elmləri namizədi

**İlham Tahirov.**

Monoqrafiyada Azərbaycan və İran dillərinin qarşılıqlı əlaqələri Azərbaycan dilçiliyində ilk dəfə olaraq dialekt və şivələr səviyyəsində tədqiqata cəlb edilmiş, dialekt leksikasının zənginləşməsində müxtəlif İran dillərinin rolu araşdırılmış, həmin dillərdən alınma sözlərin fonetik, qrammatik təbiəti və leksik-semantik xüsusiyyətləri üzə çıxarılmış, imkan daxilində İran dillərindən qədim alınma sözlər layı aşkar edilmişdir

Əsər elmi ictimaiyyət və təhsil-tədris sistemi üçün nəzərdə tutulmuşdur.

## ÖN SÖZ

Müasir dilçilik ədəbiyyatında alınma sözlərin öyrənilməsinin aktuallığı və zəruriliyi dönə-dönə qeyd edilmişdir. Azərbaycan dilçiliyində də bu problem ədəbi dil səviyyəsində kifayət qədər işlənmişdir, lakin Azərbaycan dilinin dialekt və şivələrində alınma sözlər, o cümlədən İran mənşəli alınma sözlər geniş tədqiqata cəlb olunmamışdır. Bu sahəyə ara-sıra tədqiqat əsərləri, məqalələr həsr olunsa da, ümumiyyətlə, müəyyən dialekt və şivələr qrupunda alınmalara həsr edilmiş monoqrafik tədqiqat işi yoxdur.

Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrinin əhatə etdiyi ərazidə müxtəlif dilli xalqlar yaşayır. Onlar əsrlər boyu qonşuluq şəraitində yaşayaraq müxtəlif siyasi, iqtisadi, mədəni əlaqələr saxlamışlar. Şübhəsiz, bu əlaqələr onların dillərinə təsir etməyə bilməzdi. Bu ərazidə yaşayan xalqlar arasında ümumünsiyyət vasitəsi olmuş Azərbaycan dili onların dillərinə təsir etdiyi kimi, özü də qarşılıqlı təsirə məruz qalmışdır.

Şərq qrupu dialekt və şivələrində Azərbaycan dilinin qarşılıqlı əlaqədə olduğu İran (fars, tat, talış) dillərinin təsiri özünü göstərir. Lakin bu təsir eyni səviyyədə deyil. Bu dialekt və şivələrin əhatə etdiyi bütün ərazidə qədim yazı ənənəsinə malik fars dilinin təsiri görünürsə, tat və talış dillərinin təsiri ancaq həmin dillərin yayıldığı ərazidə hiss olunur.

Qeyd edilən dialekt və şivələrdə Azərbaycan və İran dillərinin qarşılqlı əlaqələrinin araşdırılması təkcə Azərbaycan dialektologiyası üçün deyil, ümumi dilçilik və dil əlaqələrinin bəzi nəzəri problemlərinin həlli üçün də mühüm əhəmiyyət kəsb edir.

Müstəqillik qazanmış Azərbaycan respublikasında milli münasibətlərin inkişafının daha da mühüm əhəmiyyət kəsb etdiyi, Azərbaycanın Avropaya və dünyaya inteqrasiya olunduğu bir zamanda belə bir mövzuya müraciət edilməsi xüsusilə zəruridir. Milli münasibətlərin ayrılmaz tərkib hissəsi kimi dil əlaqələrinin və onların tarixinin öyrənilməsi həmin dillərin daşıyıcıları olan xalqlar

arasında ictimai iqtisadi, siyasi və mədəni əlaqələr probleminin daha müvəffəqiyyətli həllinə imkan yaradar.

Tədqiqatın əsas məqsədi Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrinin leksikasına İran dillərinin (fars, tat, talış) leksik təsirini üzə çıxarmaq, həmin dialekt və şivələrdə İran mənşəli sözlərin yerini və rolunu müəyyənləşdirməkdən ibarətdir. Dialekt və şivələrdəki İran mənşəli sözlər öz xarakterinə görə digər alınmalardan fərqlənir. Bunu nəzərə alaraq monoqrafiyada :

-dialekt və şivələrdə alınma sözlərin fonetik-morfoloji mənimsənilməsi;

-alınma sözlərin leksik-semantik xüsusiyyətlərinin öyrənilməsi;

-dialekt və şivələrdə alınma sözlərin ümumi və fərqli fone tik, morfoloji və semantik xüsusiyyətlərinin üzə çıxarılması;

-Azərbaycan toponimiyasının tədqiqində dialekt və şivələrdəki alınma sözlərin əhəmiyyəti;

-alınma sözlərin tematik qruplar üzrə təsnif edilməsi və s. məsələlər nəzərdən keçirilmişdir.

Azərbaycan dilçiliyində Azərbaycan və İran dilləri əlaqələrinin ilk dəfə olaraq dialekt və şivələr səviyyəsində geniş planda monoqrafik tədqiqata cəlb edildiyi, dialekt leksikasının zənginləşməsində müxtəlif İran dillərinin rolunun araşdırıldığı bu monoqrafiyada İran dillərindən kifayət qədər dil materialı tədqiqata cəlb edilmişdir ki, bu da həmin dillərdən alınma sözlərin fonetik, qrammatik təbiəti və leksik-semantik xüsusiyyətləri barədə müəyyən nəticəyə gəlməyə imkan vermişdir. Monoqrafiyada dialekt və şivələrin leksikasındakı alınma sözlər təkcə təhlil və təsvir edilmir. Bununla yanaşı, imkan daxilində İran dillərindən qədim alınma sözlər layı aşkar edilir, bir çox sözlərin tarixi-etimoloji inkişaf yolu izlənilir və bu məqsədlə türk, İran və digər Hind-Avropa dillərinin, eyni zamanda qədim yazılı abidələrin materiallarından istifadə olunur. Azərbaycan toponimiyasın- da alınma sözlərin işlənməsi və onların üzə çıxarılmasında dialekt və şivə materiallarının əhəmiyyətinə də diqqət yetirilir.

Türk dillərinin, xüsusilə Azərbaycan dilinin dil əlaqələri fonunda müqayisəli-tarixi, tipoloji cəhətdən öyrənilməsində, dialekt və şivələrin lüğət tərkibində substrat leksikasının müəyyənləşdirilməsində əsl mənbə olan alınma sözlər, alınma terminoloji leksika, toponim və mikrotoponimlərin vahid bir tam halında araşdırılması çox böyük nəzəri əhəmiyyət kəsb edir.

Tədqiqatın materialları və əldə olunan nəticələrdən müxtəlif sistemli dillərin müqayisəli qrammatikalarının, ali təhsil müəssisələrinin filoloji fakültələri üçün müvafiq dərslik və metodik vəsaitlərinin hazırlanmasında istifadə edilə bilər. Azərbaycan dilinin dialektoloji lüğətinin hazırlanmasında dissertasiyanın materialları xüsusilə əhəmiyyətlidir, çünki dialektoloji lüğətin 1964-cü il nəşrində və çap prosesində olan yeni nəşrində də Azərbaycan dilinin müxtəlif dillərlə qarşılıqlı əlaqələrinin nəticəsində dialekt və şivələrin lüğət tərkibinə keçən alınma sözlər dialekt vahidləri kimi verilmişdir. Əslində belə sözlərə dialekt vahidi kimi deyil, alınma sözlər kimi yanaşılmalıdır.

Bu tədqiqat işi Azərbaycan dilçiliyində müəyyən qrup dialekt və şivələrdə müxtəlif İran dillərindən alınma sözlərin araşdırılmasında ilk təcrübədir və buna görə də güman etmək olar ki, gələcəkdə nəinki Azərbaycan dilində, eləcə də ayrı-ayrı türk dillərində,onların dialekt və şivələrində və ya türk dillərinin müəyyən bir qrupunda (məsələn, oğuz və qıpçaq qrupu dillərində) eyni səpkidə tədqiqat işlərinin aparılması üçün nümunə ola bilər. Belə tədqiqatlar türk dillərində İran mənşəli alınma sözlərin və eləcə də İran dillərində türk mənşəli leksikanın ümumi və fərqli cəhətlərinin, alınma prosesinin tarixi qanunauyğunluqlarının üzə çıxarılmasına imkan yaratmış olar.

Monoqrafiyada  əsas faktik material kimi müəllifin müvafiq dialekt və şivələr üzərində canlı müşahidələri nəticəsində topladığı materiallardan, Azərbaycan dilinin dialektoloji lüğətinin çap prosesində olan yeni nəşrinin materiallarından, Azərbaycan dilçiliyində dialektologiyaya aid yazılmış dissertasiya, monoqrafiya və məqalələrdən seçilmiş söz və ifadələrdən, Nəsimi adına Dilçilik

İnstitutunun dialektologiya şöbəsinin kartotekasının materiallarından istifadə edilmişdir.

**P. S.** ***Möhtərəm oxuculara təqdim etdiyim bu monoqrafiyanı 1991-1993-cü illərdə Nəsimi adına Dilçilik İnstitutunun aspiranturasında oxuyarkən namizədlik dissertasiyası şəklində müdafiə etdiyim tədqiqat işi əsasında hazırlamışam. 1994-cü ildə həmin tədqiqat işini uğurla müdafiə etmişəm. O vaxtdan on ildən çox bir müddət keçib. Üstündən xeyli vaxt ötdüyünə görə dissertasiyanı nəşrə hazırlamaq fikrindən uzaq idim. Şəxsiyyətinə və elminə həmişə dərin hörmət və məhəbbətlə yanaşdığım görkəmli dilçi alimimiz, filologiya elmləri doktoru, professor Qəzənfər Kazımov Dilçilik İnstitutunun Dialektologiya şöbəsinə müdir gələndən sonra həmin şöbədə müxtəlif illərdə aparılmış, müdafiə edilmiş, lakin çap olunmamış tədqiqatların silsilə nəşrlərini hazırlamaq təklifi ilə həmin tədqiqat müəlliflərinə müraciət etmişdir. Artıq həmin təklifin reallaşdırılması istiqamətində xeyli işlər görülmüş, «Azərbaycan dialektologiyası» silsiləsindən yeddi kitab işıq üzü görmüş dür.Hörmətli Qəzənfər müəllim özünün təklifi ilə mənə də müraciət edəndən bəri dissertasiyanın üzərində yenidən işləyib, onu təkmilləşdirmək barədə çox düşündüm, lakin çox götür-qoydan sonra iş o zaman necə yazılıbsa, eyni şəkildə nəşrə verməyi qərarlaşdırdım. Beləliklə, «Azərbaycan dialekto logiyası» silsiləsindən səkkizinci kitab Siz oxucuların qarşısın dadır. Əsəri oxuyub dəyərli təklif və iradlarını müəllifə çatdırıcaq hər bir şəxsə öncədən minnətdarlığımı bildirirəm.***

# I FƏSİL

## AZƏRBAYCAN VƏ İRAN DİL ƏLAQƏLƏRİNİN TARİXİ KÖKLƏRİ

Azərbaycan ərazisində tarix boyu müxtəlif xalqlar yaşamış və yaşayırlar. Azərbaycanın etnik rəngarəngliyi haqqında qədim yunan, erməni, gürcü, ərəb və fars mənbələri məlumat verir.[1]

Azərbaycan özünün çox zəngin etnik, mədəni, siyasi tarixi ilə birlikdə bu ərazidə fəaliyyət göstərən dillərin qarşılıqlı əlaqələrinin öyrənilməsi baxımından maraqlı tədqiqat obyekti kimi də diqqəti çəkir. Çox qədim zamanlardan özünün çoxdilliliyi ilə tədqiqatçıların diqqətini cəlb edən Azərbaycan ərazisində müxtəlif dil ailələrinə mənsub olan yazılı və yazısız dillər təmsil olunmuşdur. Bu dillər dildaxili və dilxarici faktorların təsiri ilə inkişaf edir, bir-birini zənginləşdirirlər.

Çoxəsrlik türk-İran dil əlaqələrinin öyrənilməsi, onların fonetika, morfologiya, sintaksis və xüsusilə leksika sahəsində bir-birilərini qarşılıqlı zənginləşdirmələrinin tədqiq edilməsi həm türkologiya, həm də iranşünaslıq və eləcə də ümumi dilçilik və dil əlaqələri problemi üçün əvəzsiz əhəmiyyət kəsb edir.

Türk-İran dil əlaqələrinin bütün geniş spektrinə toxunmadan və bunu qarşıya məqsəd qoymadan qeyd etmək olar ki, türk dillərinin, o cümlədən Azərbaycan dilinin də daxil olduğu oğuz qrupu dillərinin tarixi leksikologiyasının bir sıra mühüm problemlərini İran dilləri ilə qarşılıqlı əlaqələri nəzərə almadan düzgün şəkildə başa düşmək və həll etmək olmaz. Bununla yanaşı, türk dillərinin, eləcə də İran dillərinin bir sıra dialekt və şivələrinin formalaşması tarixini türk-İran etnodil əlaqələrini nəzərə almadan tədqiq etmək düzgün olmazdı və mümkün deyil.

---

[1] Bu barədə bax: Алиев К. Античные источники по истории Азербайджана. Баку, 1986; Гусейнов Р.А. Сирийские источники XII-XIII вв. об Азербайджане. Баку, 1960; Ибн Хордадбек. Книга путей и стран. Баку, 1986; Мамедов Т.М. Албания и Атропатена по армянским источникам (IV-VII вв.). Баку, 1977; Vəlixanlı N. IX-XII əsr ərəb coğrafiyaşünas-səyyahları Azərbaycan haqqında. Bakı, 1974 və s.

Türk-İran dil əlaqələri heç də dünənin, bugünün hadisəsi deyildir. Bu əlaqələrin çox dərin tarixi kökləri vardır.

Həm türk, həm də İran dilləri üçün onların qarşılıqlı əlaqələrinin əhəmiyyəti haqqında tcrkoloqlar, iranşünaslar qeyd etmişlər. Türk dillərinin tarixi məsələlərinə dair çox dəyərli fikirləri olan akad. A.N.Kononov yazırdı: «Türkdilli xalqların mədəni əlaqələrinin tarixi üçün bir tərəfdən, ərəb və İran dillərindən türk dilərinə, digər tərəfdən, türk dillərindən ərəb və İran dillərinə alınmaların araşdırılması Çin və Soqdi dillərindən qədim leksik alınmaların öyrənilməsi qədər böyük maraq və əhəmiyyət kəsb edir».[2]

«İran dilləri, görünür, türk dilləri ilə ən erkən qarşılıqlı əlaqələri olan Hind-Avropa dillərindəndir».[3]

İran dillərinin tarixi inkişafına dərindən bələd olan görkəmli iranşünas İ.M.Oranski türk-İran dil əlaqələrini çox qədim köklərə malik olduğuna işarə edərək yazırdı: «Min ildən yuxarı İran-türk dil əlaqələri nəticəsində Orta Asiya, İran, Zaqafqaziya və Kiçik Asiyanın türk dillərinə xeyli miqdarda İran (xüsusilə fars) sözləri keçmiş və əksinə, İran dilləri və dialektlərinə çoxlu türk (və monqol) alınma sözləri daxil olmuşdur».[4]

Göründüyü kimi, yuxarıda sadalanan fikirlər geniş mənada türk-İran əlaqələri haqqındadır. Türk-İran dil əlaqələrinin tərkib hissələrindən biri kimi Azərbaycan dilinin İran dilləri – fars, tat, talış dilləri ilə qarşılıqlı əlaqələrinin tarixinə qısa şəkildə nəzər salmaq tədqiq olunan problemin hansı tarixi köklərə söykəndiyini açıb göstərmək, həmin problemin tədqiqat mövzusu kimi götürülməsinin heç də təsadüfi olmadığını sübut etmək, xüsusilə indiki şəraitdə respublikamızda milli münasibətlərin inkişafı baxımından maraqlı olardı.

Azərbaycan və İran dillərinin qarşılıqlı əlaqələrinin kökləri çox qədimdir. Belə bir müddəa həm tarixi, həm də linqvistik faktlarla təsdiqlənir.

---

[2] Кононов А.Н. Тюркское языкознание в СССР на современном этапе. Итоги и проблемы // Проблемы современной тюркологии (Материалы тюркской конференции), Алма-Ата, 1980, стр.19.
[3] Мусаев К.М. Тюркско-иранские языковые контакты // СТ, 1986, № 6, стр.26.
[4]Оранский И.М. Иранские языки в историческом освещении. М., 1979, стр.72.

Elmi mənbələrdə Azərbaycan və İran dillərinin əlaqələrini təsdiqləyən çoxsaylı tarixi faktlara rast gəlmək olar.

Tədqiqatçılar qeyd edirlər ki, irandilli tayfaların şimal-şərqdən cənub-qərb istiqamətindəki miqrasiyası prosesində Talış zonası müstəsna rol oynamışdır. İrandilli tayfaların müasir İran ərazisinə Qafqaz yolu ilə keçməsini iddia edən tarixçilər bu zonanı Qafqaz (xüsusilə Zaqafqaziya) ilə İran arasında maddi mədəniyyətin qapısı adlandırırlar. M.N.Poqrebova e.ə. II minilliyin sonu – I minilliyin əvvəlində Şərqi Zaqafqaziya ilə İranın əlaqələrindən danışarkən qeyd edir: «Ön Asiyanın İran tipli xəncərləri Zaqafqaziyada Mil düzü və Naxçıvan ərazisindən tutmuş şimala – Şimali Osetiyaya qədər yayılmışdır. Onların biri istisna olmaqla hamısı Qafqazın şərq hissəsində tapılmışdır. Görünür, İran-Qafqaz əlaqələri bu halda Talış vasitəsilə baş vermişdir. Şərqi Zaqafqaziyada tapılan Ön Asiya tipli xəncərlərdən biri bilavasitə talış mənşəlidir».[5]

Eramızdan əvvəl VIII-VII əsrlərdən başlayaraq Azərbaycana, xüsusilə Talış zonası da daxil olmaqla Xəzər sahili bölgələrə irandilli tayfaların gəlməsi intensiv hal təşkil edir. Azərbaycanın cənub-qərbindən İran istiqamətində hərəkət edən kimmerilər, skiflər, saklar Talış zonasından yan keçə bilməzdilər.

Tədqiqatçıların təxmin etdiyinə görə, kimmeri və skiflərdən başqa, qərbi İran tayfaları – midiyalılar, farslar, saqartilər və b. da İrana Qafqaz (xüsusilə Azərbaycan) yolu ilə keçmişlər.[6] Midiyada rəsmi (ola bilsin ki, tayfalararası) dil, şərti olaraq «Midiya dili» adlandırılan dil olmuşdur. Həmin dildə yazılı abidələr, mətnlər bizə gəlib çatmamışdır.[7] Midizmlərə – xüsusilə antroponim və etnonimlərə və eləcə də ayrı-ayrı sözlərə assur, yunan mənbələrində və qədim fars qayaüstü yazılarında rast gəlinir. Buna baxmayaraq

---

[5] Погребова М.Н. К вопросу о связях Восточного Закавказья и Ирана в конце II – начале I тыс. до н.э. // История Иранского государства и культуры. М., 1971, стр.191.

[6] Грантовский Э.Р. Ранняя история иранских племен Передней Азии. М., 1970, стр.340.

[7] İran dillərinin gözəl mütəxəssisi V.B.Henninqə görə, Msxetdə arami yazılı kitabələrin biri Midiya dilində, daha dəqiq desək, orta Midiya dilində yazılmış mətndən ibarətdir. –Bu barədə bax: Алиев И.Г. Очерк истории Атропатены. Баку, 1989, стр.29.

güman etmək olar ki, Herodotun «Tarix»ində (e.ə. V əsr) adları çəkilən altı Midiya tayfası *lingua franca*'ya malik olmuşlar.

İranşünasların fikrinə görə, e.ə. V-III əsrlərdə Atropatenada fəaliyyət göstərən İran dili İberiyada danışılan İran dilinə yaxın olmuşdur.[8]

Atropatena ilə Albaniya sıx əlaqəli olmuşdur. Azərbaycanın bu iki vilayəti nəinki mədəniyyət, eləcə də etnik mənada bir-birinə yaxın idi. Bu ərazilərdə təmsil olunan İran dialektlərinin iki qohum dilin dialektləri olması fikri irəli sürülür. Hər halda İran dillərinin qəbul olunmuş bölgüsündə Midiya dialekt massivi şimal-qərb qrupu, qədim fars dili isə cənub-qərb qrupu İran dillərinə aid edilir.[9] İran dillərinin müasir dialekt qruplarından bir neçəsi, o cümlədən talış dili də bir sıra xüsusiyyətlərinə görə Midiya dilinin, daha dəqiq desək, Midiya dialekt massivinin qalığı hesab edilir.[10]

Talış dilinin bir çox fonetik, morfoloji və sintaktik xüsusiyyətlərinə görə Azərbaycan və İran ərazisindəki fars, tat, kürd və digər İran dillərindən fərqləndiyi artıq sübut olunmuşdur. Tədqiqatçılar talışları bu ərazidə mövcud olan digər irandilli etnoslardan fərqləndirən ayrı faktorları da qeyd edirlər. Onlardan biri talışların əsrlərdən bəri qapanıb qaldığı ərazi bütövlüyüdür. Bunu nəzərə alaraq S.Ə.Kəsrəvi talışları Əhəmənilər dövründən Azərbaycanın şimal-şərq dağlarında yaşayan qədim kadusilərin nəsilləri sayır.[11]

Kadusilər (kaduslar) haqqında ilk məlumata Herodotda rast gəlirik. O, kadusilərin Əhəmənilərin XI satraplığı tərkibində olmasını qeyd edir.[12] Sonralar kadusilər haqqında digər antik müəlliflər də məlumat verirlər. Kadusilər müasir talışların əcdadları olmuşdur və onların məskunlaşdığı ərazi Atropatenaya aid

---

[8] Bu haqda V.B.Henninqə istinadən N.X.Məmmədov bəhs edir. –Bax: Мамедов Н.Х. Исторические корни азербайджанско-иранских языковых взаимоотношений // СТ, 1990, № 1, стр.53.
[9] Оранский И.М. Иранские языки в историческом освещении, стр.38-39.
[10] Миллер Б.В. Талышский язык. М., 1953, стр.229; Касумова С.Ю. Южный Азербайджан в III-VIII вв. Баку, 1983, стр.40.
[11] Kesrevi S.A. Nameha-ye Şehrha ve dehha-ye İran. Teheran, 1956, s.20-41.
[12] Гейбуллаев Г.А. К этногенезу азербайджанцев (историко-этнографическое исследование). Т.I. Баку, 1991, стр.360.

edilmişdir.[13] Diqqəti cəlb edən faktlardan biri də odur ki, kadusilərin yaşadığı yerlər haqqında antik müəlliflərin verdiyi məlumatlarla ərəb müəlliflərinin «at taylasan»lar (talışlar) barədəki məlumatları üst-üstə düşür, uyğun gəlir.[14]

Talışlara xüsusi məqalə həsr etmiş Ə.Rəcəbov də müxtəlif mənbələrə əsaslanaraq qeyd edir ki, kadusilər talışların əcdadlarıdır.[15]

Talışların və talış dilinin mənşəyinə dair tədqiqatçıların fikirlərini təhlil edən N.X.Məmmədov bu dilin V əsrdə müstəqil dil kimi mövcud olduğu qənaətinə gəlir.[16] Tarixi və linqvistik faktlar bu fikri qəbul etməyə və eyni zamanda Azərbaycan-talış dil əlaqələrinin həmin dövrdən başlanması qənaətinə gəlməyə əsas verir.

İrandilli tatların Azərbaycan ərazisinə gəlməsi haqqında tədqiqatçılar müxtəlif fikirlər irəli sürürlər. Bəzi müəlliflərə görə, tatların bir qrupunun Azərbaycana köçürülməsi hadisəsi İran şahı Keykavusun nəvəsi I Keyxosrov dövründə baş vermişdir.[17] Bəziləri daha qədimə gedərək yazırlar ki, tatlar e.ə. 700-cü ildə Azərbaycana gəlmiş ari tayfalarındandır.[18] Başqaları tatların Azərbaycan ərazisinə gəlişini eramızın II-VII əsrlərinə aid edirlər.[19] Bu tədqiqatçıları birləşdirən ümumi fikir ondan ibarətdir ki, tatlar Azərbaycana köçürmə siyasəti nəticəsində gəlmişlər. «Sasani hökmdarları Albaniyanı öz hakimiyyətləri altında saxlamaq və orada özlərinə dayaq yaratmaq üçün Albaniyaya İran dillərində danışan əhali köçürürdülər. Onlar Sasanilər üçün strateji əhəmiyyət kəsb edən rayonlarda yerləşdirilirdi. Bu əhali Abşeronun, indiki

---

[13] Yenə orada, s.360.

[14] Vəlixanlı N.V. IX-XII əsr ərəb coğrafiyaşünas-səyyahları Azərbaycan haqqında. Bakı, 1974, s.16.

[15] Rəcəbov Ə.Ə. Talışlar // «Tolışi sədo» qəzeti, 1992, № 1, 2.

[16] Мамедов Н.Х. Исторические корни азербайджанско-иранских языковых взаимоотношений // СТ, 1990, № 1, стр.54.

[17] Hacıyev M.İ. Tat dilinin Qonaqkənd ləhcəsi. Bakı, 1971, s.23-24.

[18] Алиев К. К вопросу языков на территории Азербайджана // Труды Института Истории АН Азерб.ССР, т.XIV, 1960, стр.47.

[19] Əhmədov T.M. Azəri dili ilə tat dilinin qarşılıqlı əlaqəsinə aid bəzi qeydlər // ADU-nun «Elmi Əsərləri», dil və ədəbiyyat seriyası, 1965, № 6, s.81.

Şamaxı, Dəvəçi, Quba və başqa rayonlarının ərazisində məskən salırdılar. Onların qalıqları indi də bu yerlərdə yaşamaqdadır».[20]

«Sasani çarları Qubad və onun oğlu Xosrov Ənuşirvanın dövründə Abşeron yarımadasından başlayaraq Azərbaycan ərazisinin Xəzəryanı zolağına irandilli əhalinin yeni dəstəsi köçürüldü… «Tat» adlandırılmış bu irandilli köçkünlərin kütləviliyi və onların Azərbaycanın şimal-şərqində – Şirvanda, Dəvəçi-Quba və Abşeron yarımadasında – bir-birinə yaxın ərazilərdə yerləşdirilməsi, bununla yanaşı öz dillərini uzun müddət saxlaması səbəbindən həmin zona – indiyə qədər sıx irandilli onomastika ilə örtülmüşdür».[21]

İrandan köçürülmüş əhali və onların qalıqları haqqında A.Bakıxanov XIX əsrdə yazırdı: «Şamaxı və Qudial (Quba) şəhərləri arasında yerləşən bütün mahalların əhalisi, Şirvan qəzasının Göüz, Lahıc və Qoşunlu, Quba qəzasının Barmaq, Şeşpara, Buduqun aşağı hissəsi və Bakı qəzasının hamısı, tərəkəmə və ya türkmənlərin yaşadığı altı məntəqə istisna olmaqla tat dilində danışır ki, bu da onların fars mənşəli olmasını göstərir».[22]

Sasanilərin köçürmə siyasəti nəticəsində qeyd edilən ərazidə Qərbi İran etnik elementinin nəzərə çarpacaq dərəcədə artması tat dilinin formalaşmasına əlverişli zəmin yaratdı.

Sasanilərin hərbi-strateji məqsədlərlə bağlı həyata keçirdikləri bu köçürmə zamanı irandilli əhali imperiyanın ayrı-ayrı rayonlarından və müxtəlif vaxtlarda köçürüldü. Belə hesab etmək olar ki, indi tatlar arasındakı dil fərqləri o zamankı qəbilə-tayfa fərqlərinin nəticəsidir. «Bu fərqlər elə o zamandan – köçürmə dövründən əvvəl mövcud olmuş və indi də öz xüsusiyyətini saxlamaqdadır».[23]

IV əsrdən başlayaraq Sasanilər Albaniyanın şimal sərhədlərini, xüsusilə Çul-Dərbənd istiqamətindəki sərhədlərini möhkəmləndirməyə diqqət yetirirlər. Şimaldan türkdilli tayfaların kütləvi

---

[20] Azərbaycan tarixi. I c., Bakı, 1961, s.98.
[21] Сумбатзаде А.С. Азербайджанцы – этногенез и формирование народа. Баку, 1990, стр.73-74.
[22] Бакиханов А. Гюлистани-Ирам. Баку, 1991, стр.24.
[23] Əhmədov T.M. Azəri dili ilə tat dilinin qarşılıqlı əlaqəsinə aid bəzi qeydlər // ADU-nun «Elmi Əsərləri», dil və ədəbiyyat seriyası, 1965, № 6, s.83.

hücumları Sasani imperiyasını çox narahat edirdi. Buna görə də I Yezdəgird dövründə V əsrdə Dərbənd zonasına İrandan (əsasən Gilan ərazisindən) 10 min ailə köçürüldü. Az sonra 30 min mehrani ailəsi Arran zonasına köçürüldü. V.F.Minorskiyə istinad edən N.X.Məmmədov yazır ki, belə hallara ola bilsin ki, əvvəllər hələ Əhəmənilər dövründə də Qafqaz keçidlərini şimal tərəfdən ehtimal edilən basqınlardan qorumaq məqsədilə yol verilmişdir.[24]

S.Aşurbəyli Şirvan zonasındakı bəzi irandilli tayfaların Lahıcandan, Təbəristandan, Gilandan və b. yerlərdən gəldiyini qeyd edərək yazır: «Tatlar, şübhəsiz, Şirvan ərazisində qədim etnik təbəqələrdən biridir».[25]

A.L.Qrünberq müsəlman tatlarının (Lahıc və onun ətrafındakı kəndlər də daxil olmaqla) 2000 kv.km sahəni əhatə etdiyini göstərir.[26]

Beləliklə, yuxarıda deyilənləri yekunlaşdırıb belə nəticəyə gəlmək olar ki, qeyd edilən ərazidə VIII-IX əsrlərdə tat dili formalaşır. Tatların yerləşmə arealı ilə tatdilli toponimiyanın yayılma arealı da gəldiyimiz nəticəni təsdiqləyir. Şübhə yoxdur ki, tat-Azərbaycan dil əlaqələri də bu zamandan başlayır.

Beləliklə, VII əsrin ortalarına yaxın Azərbaycan əhalisinin etnik tərkibi üç komponentdən ibarət olmuşdur: Azərbaycanın bütün ərazisi boyu türkdilli, şimal-qərb zonasında qafqazdilli və irandilli (şimal-şərqdə tatlar, cənub-qərb tərəfdə talışlar).[27]

Müşahidələr göstərir ki, Azərbaycanın müasir əhalisinin etnik tərkibi və yerləşməsi onun qədim dövrdəki mənzərəsini zəif şəkildə də olsa əks etdirə bilir.[28] «Coğrafi adların arealı Albaniyanın qədim əhalisinin yayıldığı sahənin xəritəsini bərpa etməyə imkan verir. Qafqazdilli əhali Kürdən şimalda və cənubda olan ərazidə, irandilli əhali ilə əsasən Azərbaycanın şərqində məskunlaşmışdı (buraya

---

[24]Мамедов Н.Х. Исторические корни азербайджанско-иранских взаимоотношений // СТ, 1990, № 1, стр.54.
[25] Ашурбейли С. Государство Ширваншахов. Баку, 1983, стр.21.
[26] Грюнберг А.Л. Язык североазербайджанских татов. Л., 1963, стр.5.
[27] Бах: Сумбатзаде А.С. Азербайджанцы – этногенез и формирование народа. Баку, 1990; Гейбуллаев Г.А. К этногенезу азербайджанцев. Баку, 1991, стр.368.
[28] Əzizov E.İ. Azərbaycan dilinin tarixi dialektologiyası (Dialekt sisteminin təşəkkülü və inkişafı). Doktorluq diss. Bakı, 1990, s.65.

Abşeron və İranadək olan sahil zolağı mənsub idi). Türkdilli əhali isə əsas etibarilə Kür, Araz çayları arasında və bunlardan daha cənubda olan ərazidə məskən salmışdı».[29]

Türkdilli etnoslar V-VI əsrlərdən üstünlük təşkil edir, onlar irandilli və qafqazdilli əhalinin yerləşdiyi arealda da təmsil olunurdular. Türkdilli əhalinin belə geniş ərazidə yayılmasının və Azərbaycan dilinin Azərbaycanda yaşayan türk və qeyri-türklər arasında ümumi ünsiyyət vasitəsinə çevrilməsinin səbəblərini iqtisadi faktorlarla əlaqələndirən Ə.Sumbatzadə yazır ki, talışlar və tatlar, Dağıstan xalqları əsrlərdən bəri məskunlaşdığı yerlərdə oturaq həyat keçirdiyindən az hərəkətdə olmuşlar. Azərbaycandakı türkdilli tayfalar köçəri həyat sürdüyündən həm qış, həm də yay otlaqlarına ciddi ehtiyac hiss edirdilər, buna görə də onlar nəinki düzənliklərdə, eləcə də dağlıq yerlərdə geniş ərazini tuturdular. Köçəri maldarlıq və qoyunçuluq adlanan bu iqtisadi faktor onları ildə iki dəfə düzən yerlərdən dağlıq yerlərə və əksinə hərəkət etməyə məcbur edirdi. Bu hərəkətetmələr zamanı türkdilli tayfalar həmin istiqamətlərdə məskunlaşmış qeyri-türk xalqlarla qaynayıb-qarışırdılar. Həmin əlaqələrin əsas müəyyənedici amili oturaq-əkinçilik və köçəri maldarlıq məhsullarının mübadiləsi idi. Əlbəttə, belə əlaqələr prosesində Azərbaycan dili məkan münasibətləri baxımından tədricən ümumxalq danışıq dilinə çevrilirdi.[30]

Məhz bu səbəbdən VI-VII əsrlərdə Azərbaycan dili etnik və dil mənsubiyyətindən asılı olmayaraq bütün azərbaycanlılar üçün *lingua franca* funksiyasını yerinə yetirməyə başlayır.[31]

Beləliklə, mövcud faktlara əsasən belə güman etmək olar ki, Azərbaycan ərazisində qeyri-türk əhali ilə türk etnosu arasındakı ardıcıl iqtisadi etnomədəni və etnolinqvistik əlaqələr IV-V əsrlərdən başlamışdır.

Azərbaycan dili ümumi ünsiyyət vasitəsinə çevrilməklə fars, talış və tat dillərinə müəyyən təsir göstərməyə başlayır. Bunu

---

[29] Yüzbaşov R., Əliyev K., Sədiyev Ş. Azərbaycanın coğrafi adları. Oçerklər. Bakı, 1972, s.89.

[30] Сумбатзаде А.С. Азербайджанцы – этногенез и формирование народа. Баку, 1990, стр.150.

[31] Мамедов Н.Х. Исторические корни азербайджанско-иранских взаимоотношений // СТ, 1990, № 1, стр.57.

konkret linqvistik faktlar da təsdiqləyir. Q.Derfer[32], H.Zərinəzadə[33], Ə.Dəmirçizadə[34], M.Rəhimov[35], V.Aslanov[36] və başqaları Azərbaycan və fars dillərinin qarşılıqlı əlaqələrinin ilk orta əsrlərdə başlandığını qeyd edirlər. Başqa tədqiqatçılar bir qədər də irəli gedərək yazırlar: «Müasir fars və türk dillərində **ki** bağlayıcısının, I və III şəxs əvəzliklərinin (***mən, o***//***u***), həmçinin eyni məqamlarda şəxs və xəbərlik şəkilçilərinin uyğunluğu da (I şəxs təkdə – **m** ünsürünün işlənməsi, III şəxs təkdə isə bu şəxs anlayışının sıfır morfemlə ifadəsi) göstərir ki, bu müxtəlif sistemli dillərdə məhz çox qədim dövrlərdən qarşılıqlı nüfuzetmə başlamışdır. Şübhəsiz, bu başlanğıc Midiya dövründən əvvəllərə gedir və Midiya dövründə bu qarşılıqlı təsir daha həlledici səviyyədə olmuşdur».[37]

Azərbaycan-fars qarşılıqlı dil əlaqələrinin izlərinə dilimizin möhtəşəm abidəsi «Kitabi Dədə Qorqud» dastanlarında[38], saysız-hesabsız qədim yazılı abidələrimizdə, klassik ədəbiyyat nümunələrimizdə də rast gəlirik. «Kitabi Dədə Qorqud»da və başqa abidələrdə qeydə alınmış bir çox fars sözləri indi də Azərbaycan ədəbi dilində işləkdir. Bununla yanaşı, ədəbi dilimizdə işlənməyən və ya müəyyən dəyişikliklərlə işlənən bir sıra sözlərə (***adinə, dam, saxt, tən*** və s.) indi dialekt və şivələrimizdə rast gəlinir. ***Şah, şahənşah, padşah, şəhrdar, mərzban, xərac, bac, dirhəm*** və s. sosial terminlərin, zərdüş -tiliklə bağlı sözlərin (***Zərdüşt, Avesta,***

---

[32] Doerfer G. Türkische und mongolische Edemente im Neupersischen. Bd.1-4, Wiesbaden, 1963-1973.
[33] Zərinəzadə H.Fars dilində Azərbaycan sözləri. Bakı, 1962.
[34] Dəmirçizadə Ə. Azərbaycan ədəbi dili tarixi. I hissə. Bakı, 1979, s.104.
[35] Rəhimov M.Ş. Azərbaycan dilinin XVI əsr yazılı abidəsində işlənmiş bir sıra sözlər haqqında // Azərb.SSR EA «Xəbərləri», ictimai elmlər seriyası, 1962, № 8, s.41-48.
[36] Aslanov V.İ. XII əsrə qədərki Azərbaycan dili haqqında // AFM, I buraxılış, Bakı, 1983, s.73-83; *Yenə onun.* Daxili bərpa üsulu və Azərbaycan dilinin yazıyaqədərki fonomorfoloji və leksik-semantik mənzərəsinin öyrənilməsi // AFM, II buraxılış, Bakı, 1984, s.38-43.
[37] Hacıyev T.İ., Vəliyev K.N. Azərbaycan dili tarixi. Bakı, 1982, s.13.
[38] Dəmirçizadə Ə. «Kitabi Dədə Qorqud» dastanlarının dili. Bakı, 1959; Пириев Э.Р. Персидские слова в языке «Книги моего Деда Коркуда» (историко-сравнительное исследование). АКД, Баку, 1989.

***div, əjdaha*** və s.)[39] Azərbaycan dilində işlənməsi yüz illərlə ölçülür. Onların Azərbaycan dilinə keçməsi Sasanilər dövrünə aid edilir [40].

Azərbaycan və fars dillərinin qarşılıqlı əlaqələrinin qədimliyini Azərbaycanda və İranda onlarla paleotoponimlər, xüsusilə paleooykonimlər, türk və İran mənşəli söz və topoformantların köməyi ilə əmələ gələn düzəltmə və mürəkkəb toponimlər də təsdiqləyir [41].

Azərbaycan dilinə ərəb dilindən bilavasitə söz alınması şübhə doğurmur. İndinin özündə belə Azərbaycan dilində işlənən ərəb və fars sözlərinin nisbətini nəzərdən keçirdikdə ərəb sözlərinin üstünlük təşkil etməsi açıq-aşkar görünür. Bu faktın doğruluğuna əmin olmaq üçün «Ərəb və fars sözləri lüğəti»ndə sadə hesablama əməliyyatı aparmaq kifayətdir. Bu barədə bəzi tədqiqatçılar da qeyd edirlər[42]. Şübhə yoxdur ki, bu məsələdə həlledici rolu din amili oynamışdır. Ərəb sözlərinin də əksəriyyətini dinlə bağlı leksik vahidlər təşkil edir. Bununla belə ərəb sözlərinin hamısının Azərbaycan dilinə bilavasitə ərəb dilindən keçmədiyi haqqında fikir mövcuddur. Belə ki, Azərbaycan dilində işlənən ərəb sözlərin də «ə»ləşməyə və «e»ləşməyə meyl daha çox özünü göstərir. Bu hal klassik mətnlərdə çox müşahidə edilir. Tədqiqatçıların fikrincə, bu bir daha göstərir ki, ərəb sözlərinin əksəriyyəti dilimizə fars dili və fars dilində yazıb-yaratmış azərbaycanlı müəlliflərin əsərləri vasitəsilə keçmişdir [43].

Azərbaycan və ayrı-ayrı İran dillərinin istər ədəbi dil, istərsə də dialekt səviyyəsindəki qarşılıqlı əlaqələrini tədqiq edən alimlərin

---

[39] Асланов А.М. Азербайджанский язык в орбите языкового взаимодействия. Баку, 1989, стр.32.
[40] Yenə orada, s.32.
[41] Bu barədə bax: Axundov A. Torpağın köksündə tarixin izləri. Bakı, 1983; Əhmədov T. Azərbaycan toponimikasının əsasları. Bakı, 1991; Гейбуллаев Г.А. Топонимия Азербайджана (историко-этнографическое исследование). Баку, 1986 və s.
[42] Ə. Dəmirçizadə «Kitabi Dədə Qorqud» dastanlarında 350 ərəb, 136 fars mənşəli sözün işləndiyini qeyd edir. Bax: Dəmirçizadə Ə. Azərbaycan ədəbi dili tarixi. I hissə, Bakı, 1979, s.125.
[43] Payizov M.K. Klassik mətnlərdə alınma sözlərin transkripsiyası problemlərinə dair // Böyük Oktyabr sosialist inqilabının 70 illiyinə həsr edilmiş «Klassik mətn və transkripsiya məsələləri» elmi-nəzəri konfransının məruzələrinin tezisləri, Bakı, 1987, s.25.

gəldiyi nəticələr göstərir ki, türk dillərinin qədim və orta dövrünə aid bir çox fonetik, qrammatik və semantik hadisələr İran dillərində bu günə qədər mühafizə olunmuşdur. Azərbaycan dilinin qədim dövrü üçün xarakterik olan, indi isə arxaikləşmiş və ya ədəbi dildən çıxmış çoxlu sayda leksik vahidlər bu ərazidə yaşayan qeyri-türk xalqlarının dillərində relikt halında qorunmuşdur. Həmin sözlərin qədim forması türk dillərinin özünə nisbətən daha etibarlı, dəyişilməz halda saxlanmışdır. Misallara müraciət edək.

Azərbaycan ədəbi dilində işlənməyən, onun dialekt və şivələrində fonetik və ya semantik cəhətdən müəyyən dəyişikliklərə uğrayaraq işlənən ***qəylə, çəkürkə, toğay, bünq, ülqi//ülqü, ğatığ*** və s. qədim türk sözləri talış dilində etibarlı şəkildə qorunmuşdur. Həmin sözlərin talış dilində işlənən formaları VI-VII əsrlərdəki türk variantlarına daha yaxındır[44].

***Qabağ***//***qəbəğ*** «alın», ***qəjğun***//***qəzğan*** «qazan», ***dəğmə*** «damğa», ***ğeyğülü***//***qayğulu*** «yuxulu», ***sürt*** «yoxuş» və s. sözlər tat dilində bugün də işlənir [45]. Türk dillərinin qədim fonetik hadisələrindən sayılan **d ~ c // t ~ c** əvəzlənməsinin izləri müasir Azərbaycan dilində də qalmışdır. Bu qədim fonetik hadisə tat dilindəki türkizmlərdə saxlanmışdır [46].

İran dillərində işlənən qədim türk sözləri Azərbaycan-İran əlaqələrinin qədimliyini təsdiqləyən linqvistik faktlardır. Məhz bu faktlar əsasında tədqiqatçılar Azərbaycan dilinin yazıyaqədərki dövrünə aid müəyyən məqamları üzə çıxarır, ayrı-ayrı sözlərin ilkin semantik strukturunu bərpa edir [47], Azərbaycanda səlcuqlardan əvvəl Azərbaycan dilinin fəaliyyət göstərdiyini, sonralar

---

[44] Мамедов Н.Х. Азербайджанско-талышские языковые связи на уровне лексики // AFM, II buraxılış, Bakı, 1984, s.111-116; *Yenə onun*. Отражение древнетюркских лексических элементов в талышском языке // СТ, 1980, № 3, стр.57-68.

[45] Ахмедов Т.М. Некоторые древнетюркские слова в татском языке // СТ, 1971, № 6, стр.69-79.

[46] Ахмедов Т.М. Лексические взаимоотношения азербайджанского и татского языков. АКД, Баку, 1969, стр.8.

[47] Мамедов Н.Х. Значение данных талышского языка в изучении истории азербайджанского языка дописьменного периода // СТ, 1984, № 6, стр.15-22.

Azərbaycan dilinin bu ərazidə yaşayan tayfalar və xalqlar arasında ümumi ünsiyyət vasitəsi olduğunu qeyd edirlər [48].

Azərbaycan dilinin tarixi üçün əvəzedilməz əhəmiyyətə malik olan belə faktlara İber-Qafqaz dillərindən udin [49], ləzgi [50], saxur [51], gürcü [52], şahdağ qrupu dillərində [53] rast gəlmək olar.

Nəhayət, elmi ədəbiyyatda özünə az-çox mövqe qazanmış bir fikrə də münasibət bildirmək yerinə düşər. Bu məsələnin türk-İran əlaqələrinin, o cümlədən həmin əlaqələrin tərkib hissələrindən biri kimi Azərbaycan-İran dil əlaqələrinin tarixi ilə əlaqədar prinsipial əhəmiyyəti vardır.

Qəbul edilmiş ümumi fikrə görə, «Orta Asiya və daha sonra ondan qərbə (o cümlədən Zaqafqaziya və Azərbaycana – T.İ.) türk dilinin yayılması şimal-şərqi və Mərkəzi Asiyanın köçəri tayfalarının eramızın əvvəlində başlanan, gah zəif- ləyərək, gah güclənərək bütün sonrakı əsrlər boyu böyük yerdəyişmələri ilə bağlıdır»[54]. Bununla yanaşı elə gümanlar və fərziyyələr də mövcuddur ki, guya qeyd edilən dövrdən əvvəl türk-İran qarşılıqlı dil əlaqələrindən danışmaq əbəsdir. Lakin tarixi və linqvistik faktlar bu fikri təkzib edir.

---

[48] Рагимов М.Ш. Значение неродственных языков на территории Азербайджана в сравнительно-историческом изучении тюркских языков огузской группы // СТ, 1971, № 2, стр.50-58.

[49] Гукасян В.Л. Взаимоотношения азербайджанского и удинского языков. АДД, Баку, 1973; *Yenə onun*. Древние тюркизмы в удинском языке // «Известия» АН Азерб.ССР, серия литературы, языка, истории, 1978, № 2, стр.66-80.

[50] Кубатов А.Б. Лексическое взаимоотношение азербайджанского и лезгинского языков: на материале кубинских говоров. АКД, Баку, 1973.

[51] Асланов А.М. Взаимоотношения азербайджанского и цакурского языков: на материале закатальско-кахских говоров. АКД, Баку, 1965.

[52] Алиева Ф.Г. Тюркизмы в средневековых грузинских источниках (на основе грузинской летописи «Картлис цховреба»). АКД, Баку, 1992; Гукасян В.Л. Об азербайджанско-грузинских языковых контактах // СТ, 1980, № 4, стр.22-33.

[53] Кубатов А.Б. Взаимоотношения азербайджанского языка и шахдагско-лезгинской группы языков: на материале литературных языков и диалектов. АДД, Баку, 1992.

[54] Основы иранскогоязыкознания. Древнеиранские языки. М., 1979, стр.45-46.

İranşünaslıqda qəbul edilmiş bölgüyə əsasən [55] qədim İran dilləri qrupuna aid edilən Avesta dilində [56] bi sıra türk mənşəli sözlərin işləndiyi göstərilir [57].

Avestada türkizmlərə misal göstərilən sözlər sırasında ***kāra*** diqqəti cəlb edir. Bu söz «xalq, kütlə, qara camaat» mənasında işlənmişdir [58]. ***Kāra*** sözü qədim fars dilində yuxarıda göstərilən mənadan əlavə «ordu» anlamında da işlənmişdir [59]. Midiya tarixi üzrə mütəxəssislər «ordu» mənasının bilavasitə «xalq» mənası ilə bağlı olduğunu qeyd edirlər, çünki «***kāra*** termini altında ordunun ancaq qara camaatdan təşkil edilmiş hissəsi başa düşülürdü»[60]. Bəzi alimlər isə onların üst-üstə düşdüyünü qeyd edirlər. «Midiya xalqı» və «Midiya qoşunu» anlayışları, görünür, əsasən biri-birinə uyğun gəlirdi. Silahlı xalq – icma üzvləri – eyni zamanda qoşun idi»[61]. Analoji hala türk dillərində də rast gəlinir[62]. Türk dillərində, o cümlədən Azərbaycan dilində həmin sözün məna dairəsi çox genişdir. «***Qara*** qədim İran dilinə türk dillərindən keçmişdir. Dilimizdə ***qara*** sözü rəng mənasından başqa «nəhəng», «iri» (qarayazı), «xalq kütləsi» (qara camaat), «iri buynuzlu heyvan» (mal-qara və ya qara mal), «kabus» (qara basmaq) və s. mənalar verir. Dilçilikdən yaxşı məlumdur ki, alınma sözün bu qədər geniş məna dairəsi və saysız-hesabsız derivatları ola bilməz»[63].

---

[55] Оранский И.М. Иранские языки в историческом освещении. М., 1979, с.10-11.
[56] «Авестийский» (авестский) язык – под этим термином понимают язык авесты – собрания священных зороастрийских текстов. Bax: [54, s.12].
[57] Aslanov V.İ. XII əsrə qədərki Azərbaycan dili haqqında // AFM, I buraxılış, Bakı, 1983, s.78; Hüseyni Ə. «Avesta»da qədim Azərbaycan sözləri // AFM, I buraxılış, Bakı, 1983, s.137-138.
[58] Aslanov V.İ. XII əsrə qədərki Azərbaycan dili haqqında // AFM, I buraxılış, 1983, s.78.
[59] Tolman H.C. Ancient Persian Lexicon and texts. Nashville, 1908, p.80.
[60] Мамедов Н.Х., Мамедов И.Т. Об относительной хронологизации тюркско-иранских языковых контактов // СТ, 1987, № 3, стр.45.
[61] Алиев И.Г. Мидия – древнейшее государство на территории Азербайджана // Очерки по древней истории Азербайджана, Баку, 1956, стр.145.
[62] Древнетюркский словарь. Л., 1969, стр.423.
[63] Aslanov V.İ. XII əsrə qədərki Azərbaycan dili haqqında // AFM, I buraxılış, Bakı, 1983, s.78-79.

Türk və İran dillərində eyni məfhumu bildirən sözlərin identik semantik inkişafı müşahidə edilir. Bu faktın özü bir daha həmin dillərin tarixi əlaqələrinin qədimliyinə sübutdur. Çünki dildə identik semantik inkişaf hadisəsi eyni regionun (ərazinin) xalqlarının əsrlərlə qonşuluq şəraitində yaşamağının nəticəsi kimi meydana çıxır. Bu zaman dillərin qohum və ya qeyri-qohumluğu nəticəyə təsir göstərmir. Bu baxımdan görkəmli monqolşünas Q.D.Sanjeyev çox düzgün olaraq qeyd edir: «Bunu da nəzərə almamaq olmaz ki, müxtəlif regionlara nisbətən, eyni bir ərazinin dillərində onların qohum və ya qohum olmayan dillərlə əlaqələrinin xarakterindən asılı olmayaraq oxşar proseslər baş verir. Bu və ya digər dillərin əlaqələrinin öyrənilməsində belə proses və hadisələrin nəzərə alınması nəinki lazımdır, hətta çox vacibdir»[64]. Misallara müraciət edək.

***Bəy*** sözünün inkişafını izləyən tədqiqatçılar onun türk və İran dillərində oxşar semantik proseslər keçirdiyini göstərirlər: «İran (***baga-***, ***baya*** «dövlət, var, sərvət» (Avesta) və ***baga*** «allah, tanrı, ağa» (qədim fars) və türk dillərinin (***bay*** «varlı, zəngin», ***bayat*** «tanrı, ağa») materialları göstərir ki, bütün hallarda tamamilə oxşar «var, dövlət, qismət, səadət» → (xoşbəxtlik, səadət verən) → «tanrı, ağa» semantik modelinin ifadəsi baş verir»[65]. Bu dillərdə ***bəy*** sözünün ümumi leksik arxaizmlərə malik olduğu da qeyd edilir[66].

Eyni semantik hadisə türk ***ala*** və İran ***pisə*** sözlərində də müşahidə edilir[67]. Belə hallar çoxdur. Görünür, belə sözlərin oxşar semantik inkişafının nəticəsidir ki, dialekt və şivələrimizdə, bəzən ədəbi dildə də, eyni mənalı vahidlər calaqlanmış, hibrid halda işlənməkdədir.

Bu faktlar türk-İran dil əlaqələrinin tarixi barədə yuxarıda qeyd edilən fikri təkzib edərək göstərir ki, onlar (türk-İran dil əlaqələri) heç də elmi ədəbiyyatda artıq təsbit olunmuş kanonik

---

[64] Санжеев Г.Д. О тюркско-монгольских лингвистических параллелях // СТ, 1973, № 6, стр.73.
[65] Мамедов Н.Х., Мамедов И.Т. Об относительной хронологизации тюркско-иранских языковых контактов // СТ, 1987, № 3, стр.45.
[66] Yenə orada, s.46.
[67] Оранский И.М. Этимологические заметки // Вопросы иранской и общей филологии (к 70-летию проф. В.И.Абаева), Тбилиси, 1977, стр.216-221.

dövrləşdirmələr çərçivəsinə sığışmır. Bu əlaqələrin tarixi daha qədimdir. Ona görə də N.X.Məmmədov və İ.T.Məmmədovun təklif etdiyi «türk-İran dil əlaqələri təkcə ayrı-ayrı türk və İran dilləri səviyyəsində ancaq müasir dövr üçün deyil, oğuz-türk-İran, qıpçaq-türk-İran, daha sonra ümumtürk-ümumiran və ya ümumtürk-Hind-İran əlaqələri səviyyəsində xronoloji ardıcıllıqla öyrənilməlidir» fikri tamamilə orijinal və təbii görünür[68].

Türk-İran əlaqələri nəinki bu xalqların dillərində, siyasi-ictimai, iqtisadi həyatında, eyni zamanda onların xalq poeziyasında, folklorunda da əks olunmuşdur. Xalqların tarixi əlaqələri təkcə onların dilində deyil, maddi və mənəvi mədəniyyətlərində də iz qoyur. «Xalqların mənəvi mədəniyyətindəki əlaqələr onların dilində, folklorunda, musiqisində, mifologiyasında ümumi elementlər şəklində bugünümüzə gəlib çatır»[69]. Orta Asiya, İran və Azərbaycan xalqlarının eposlarının, folklorunun qarşılıqlı əlaqələrinə bir neçə sanballı əsər həsr etmiş X.Q.Koroğlu iranlıların və türklərin qədim və sonrakı epik abidələrində çoxlu paralellərin olduğunu qeyd edir. O, Mitraya (Günəşə) sitayiş edən Turan əhalisinin tərkibinə daxil olan hunlarla, Zərdüşt təlimini qəbul etmiş iranlılar arasındakı münasibətləri, hadisələri əks etdirən «Ayatkar Zareran» («Zarer haqqında kitab») adlı parfiya eposunda türk-hunların yerli irandilli əhali ilə qarşılıqlı əlaqələrinin tarixi haqqında çox qiymətli məlumat olduğunu konkret faktlarla göstərir[70]. Həmin eposun mətni bəzi dəyişikliklər edilməklə Firdövsinin «Şah-namə»sində əks edilmişdir. Müəllif həmin parfiya eposunda hunlarla bağlı bəzi detallara analoji olaraq Azərbaycan «Koroğlu» dastanında rast gəldiyini göstərir. Məsələn: «Ayatkar Zareran»da hunların başçısı Arcasp öz döyüşçülərini Zarerlə döyüşə çağırır, qələbə çalana qızı Zarstanı verəcəyini vəd edir. Müqayisə et: «Koroğlu» eposunda türk sultanı Koroğlunu öldürənə və ya əsir

---

[68] Мамедов Н.Х., Мамедов И.Т. Об относительной хронологизации тюркско-иранских языковых контактов // СТ, 1987, № 3, стр.46.
[69] Мусаев К.М. Алтайская гипотеза в свете контактов тюркских языков с языками мира // СТ, 1987, № 4, стр.54.
[70] Короглы Х.Г. Древнетюркские элементы в парфянском эпосе «Аяткар Зареран» (К проблеме ирано-тюркских взаимоотношений) // СТ, 1981, № 1, стр.49-53.

tutana öz qızını verəcəyini vəd edir. Belə paralellərə «Kitabi Dədə Qorqud»da rast gəlinir: Bayandur xanın qızını Qazana verməsi və s.

Yuxarıda qeyd edilənləri yekunlaşdıraraq belə bir nəticəyə gəlmək olar ki, Azərbaycan-İran dil əlaqələri dərin ictimai, iqtisadi, siyasi köklərə əsaslanır.

Hər bir tədqiqat işinə verilən mühüm tələblərdən biri də əvvəllər əldə olunmuş nəticələrin nəzərə alınması və onlardan səmərəli şəkildə istifadə edilməsidir. Bu baxımdan Azərbaycan və İran dillərinin qarşılıqlı əlaqələrinin öyrənilməsi məsələsinin müasir vəziyyətinə diqqət yetirilməsi müəyyən əhəmiyyət kəsb edir.

Qabağcadan qeyd etmək lazımdır ki, qədim dövrdə Azərbaycan ərazisində baş verən dil əlaqələri prosesləri haqqında elm aləminə hələlik çox az şey məlumdur. Həmin dövrdəki dil əlaqələri məsələsi mürəkkəbdir və yalnız ümumi şəkildə izah oluna bilər. Həmin dövrdə fars və ərəb dillərinin təsiri haqqında daha çox məlumat vardır[71].

Bu sahəyə aid elmi-nəzəri ədəbiyyatı nəzərdən keçirdikdə məlum olur ki, Azərbaycan və İran dillərinin qarşılıqlı əlaqələri, əsasən iki istiqamətdə öyrənilmişdir. Onlardan birincisi Azərbaycan dili ilə fars dilinin qarşılıqlı əlaqələrinin öyrənilməsi, ikinci istiqamət Azərbaycan ərazisində yazısız İran dilləri (tat, talış, kürd, xələc) ilə Azərbaycan dili və dialektlərinin qarşılıqlı əlaqələrinin öyrənilməsidir.

Azərbaycan-İran dil əlaqələrinin öyrənilməsinin ikinci istiqaməti 60-cı illərdən başlanmışdır. Həmin dövrə qədər «Azərbaycan ərazisində İran və Qafqaz-İber dillərinə Azərbaycan dilinin təsiri ayrı-ayrı məqalə və monoqrafiyalarda tədqiq edilmişdi. Əks təsir məsələsinə gəldikdə isə, yəni həmin dillərin Azərbaycan dilinə təsiri isə tamamilə öyrənilməmiş qalırdı»[72]. 60-cı illərin ortalarından başlayaraq yazısız İran dilləri ilə Azərbaycan dili və

---

[71] Бу барядя бах: Асланов А.М. Азербайджанский язык в орбите языкового взаимодействия. Баку, 1989, стр.23; Aslanov V.İ. Azərbaycanda ikidillilik və çoxdillilik (tarix və müasirliyə ümumi baxış). // Nitq mədəniyyəti məsələləri, II buraxılış, Bakı, 1992, s.14-30.

[72] Ширалиев М. Основные вопросы взаимодействия и взаимообогащения языков народов СССР (на материале азербайджанского языка) // Взаимодействие и взаимообогащение языков народов СССР, М., 1969, стр.117.

dialektlərinin qarşılıqlı əlaqələri məsələsinə həsr olunmuş məqalələr daha çox görünməyə başladı. Bu işdə o zaman Akademiyanın Ədəbiyyat və Dil İnstitutunda fəaliyyət göstərən «İber-Qafqaz və İran dilləri» şöbəsi böyük rol oynadı. Həmin şöbədə Azərbaycan dili ilə İber-Qafqaz və İran dillərinin əlaqələri öyrənilirdi.

Akademik M.Şirəliyev çox düzgün olaraq qeyd edir ki, təkcə dialekt materialı əsasında Qafqaz-İber və İran dillərinin Azərbaycan dilinə təsirini aşkar görmək olur. Bu təsirin xarakterindən bəhs edərkən, o göstərir ki, Qafqaz-İber və İran substratı ümumxalq səciyyəsi daşıyır[73]. Bu müddəanın «müəyyən düzəlişə ehtiyacı olduğunu» qeyd edən V.L.Qukasyanın fikri ilə biz də razılaşırıq[74]. Araşdırmalardan bəlli olur ki, İran substratı şərq və cənub qrupu dialekt və şivələrində özünü büruzə verir.

Azərbaycan və İran dillərinin (xüsusilə tat dilinin) qarşılıqlı leksik əlaqələrinə dair bəzi qeydlərə M.Şirəliyev[75], R.Rüstəmov[76], A.Vəliyev[77], G.Vəliyeva[78] və başqalarının tədqiqat işlərində rast gəlirik.

Tat dilinin Qonaqkənd ləhcəsini tədqiq edən M.Hacıyev 1966-cı ildə bu mövzuda namizədlik dissertasiyası müdafiə etmişdir. Tədqiqat işi tat dilinə həsr olunsa da, müəllif Azərbaycan dialektlərində (Bakı və Quba dialektlərində) işlənən bəzi tat sözləri haqqında məlumat verir. Azərbaycan dilinin Quba dialekti və tat dilinin Quba ləhcəsinin materialları əsasında Azərbaycan və tat dillərinin qarşılıqlı leksik əlaqələri məsələsini tədqiq edən T.Əhmədov namizədlik dissertasiyasında Quba dialektində işlənən tat sözlərinə bir bölmə həsr etmişdir.

Azərbaycan və talış dillərinin qarşılıqlı əlaqələri sahəsində də müəyyən işlər göz qabağındadır. «Lənkəran şivələrində toponimik

---

[73] Yenə orada, s.117.
[74] Гукасян В.Л. Взаимоотношения азербайджанского и удинского языков. Докторская дисс., Баку, 1973, стр.30.
[75] Şirəliyev M. Bakı dialekti. Bakı, 1957.
[76] Rüstəmov R. Quba dialekti. Bakı, 1961.
[77]Vəliyev A.Abşeron yarımadası qərb rayonlarının şivələri.Namizədlik diss., M., 1952.
[78] Велиева Г. Лексика восточноапшеронских говоров азербайджанского языка. Кандидатская дисс., Баку, 1984.

adlar»[79] və «Lənkəran şivələri qrupunda saitləri əvəzlənməsinə dair»[80] məqalələrində Azərbaycan və talış dillərinin qarşılıqlı əlaqələrindən bəhs edən M.Talışlı qohum olmayan dillərin əlaqələri nəticəsində Lənkəran şivəsində baş verən bəzi fonetik hadisələri qeyd edir, bir neçə toponimik adın mənşəyinə dair öz mülahizələrini irəli sürür.

Azərbaycan və talış dillərinin qarşılıqlı əlaqələrinə həsr etdiyi iki məqaləsində İ.H.Abdullayev Lənkəran şivəsində talış dilinin təsiri ilə baş verən fonetik, morfoloji və leksik hadisələri şərh edir. Məqalədə ***talış (tolış), qolış*** etnik terminlərinin mənşəyinə dair müəllifin mülahizələri söylənilir[81].

Azərbaycan və talış dillərinin qarşılıqlı əlaqələri probleminə N.X.Məmmədovun bir sıra araşdırmaları həsr edilmişdir. Müəllif bu araşdırmalarında əsasən talış dilinin leksik sistemində Azərbaycan-türk layının aşkar edilməsinə səy etmişdir. Bununla belə, Azərbaycan dialekt və şivələrində bəzi İran alınma sözlərinə aid araşdırmaları maraq doğurmaya bilməz. Müəllifin talış-Azərbaycan əlaqələrinin ictimai-tarixi köklərinin üzə çıxarılmasına həsr olunmuş «Talışca-Azərbaycanca ikidilliliyin ictimai kökləri barədə bəzi qeydlər» məqaləsi xüsusi maraq doğurur. Dilxarici və dildaxili amilləri və bunlarla bağlı əldə etdiyi faktik materialları təhlil edən müəllif bu ikidilliliyin yaranmasında və inkişafında mühüm rol oynamış üç mərhələni qeyd edir: 1) Səfəvilərin hakimiyyəti dövrünə qədər olan mərhələ; 2) Səfəvilərin hakimiyyəti dövründən oktyabr inqilabına qədər olan mərhələ; 3) Oktyabr inqilabından müasir dövrə qədər olan mərhələ[82]. Şübhəsiz, bu mərhələlər şərti götürülməlidir, çünki hər bir mərhələnin özündə ictimai-siyasi

---

[79] Talışlı M. Lənkəran şivəsində toponimik adlar // ADU-nun «Elmi Əsərləri», dil və ədəbiyyat seriyası, 1966, № 6, c.61-66.

[80] Talışlı M. Lənkəran şivələri qrupunda saitlərin əvəzlənməsinə dair // ADU-nun «Elmi Əsərləri», dil və ədəbiyyat seriyası, 1971, № 2, s.62-67.

[81] Abdullayev İ.H. Azərbaycan dilinin Lənkəran şivəsinə talış dilinin təsiri haqqında: Fonetik və morfoloji təsir // Azərb.SSR EA «Xəbərləri», ədəbiyyat, dil və incəsənət seriyası, 1967, № 2, s.57-64; Yenə onun. Lnəkəran şivəsinə talış dilinin leksik təsiri // Azərb.SSR EA «Xəbərləri», ədəbiyyat, dil və incəsənət seriyası, 1968, № 1, s.38-44.

[82] Məmmədov N.X. Talışca-Azərbaycanca ikidilliliyin ictimai kökləri barədə bəzi qeydlər // Nitq mədəniyyəti məsələləri, II buraxılış, Bakı, 1992, s.70.

vəziyyətin xarakterindən asılı olaraq müəyyən ləngimə və sıçrayışlar prosesi ilə bağlı yarımmərhələlər də vardır ki, onları nəzərdən qaçırmaq olmaz.

Azərbaycan dilinin Lənkəran şivələrini tədqiq edən A.B.Məcidova da tədqiq etdiyi şivələrdə işlənən talış sözlərinə aid müəyyən qeydlər etmişdir[83]. Lakin göstərmək lazımdır ki, müəllif əsərdə sözlərin mənalarını izah edərkən qeyri-müəyyənliyə, qüsurlara yol vermişdir.

Tədqiq olunan problemin müasir vəziyyəti haqqında yuxarıda edilən qeydlər onun öyrənilməsinin hansı mərhələdə olmasını təqribi də olsa göstərir. Bu yöndə aparılan hər bir tədqiqat işi, atılan hər bir addım problemin tam şəkildə həlli üçün, Azərbaycan və İran dillərinin qarşılıqlı əlaqələrinin inkişaf qanunauyğunluqlarının üzə çıxarılması üçün mühüm əhəmiyyət kəsb edir.

---

[83] Məcidova A.B. Azərbaycan dilinin Lənkəran şivəsi. Namizədlik diss., Bakı, 1970.

# II FƏSİL

# ALINMA SÖZLƏRİN FONETİK-MORFOLOJİ XÜSUSİYYƏTLƏRİ

Hər bir dilin özünəməxsus fonetik sistemi və qrammatik strukturu var. Fonetik sistemin və qrammatik strukturun özünəməxsusluğu, sabitliyi hesabına hər birdil ona kənardan olan təsirlərə müqavimət göstərir. Alınma sözlər də həmin müqavimətə rast gələrək keçdiyi dilin daxili qanunauyğunluqlarına uyuşur. Başqa sözlə desək, alınma sözün keçdiyi dildə mənimsənilməsi prosesi gedir. A.İ.Smirnitskinin obrazlı ifadəsi ilə desək, alınma söz «söz alan dilin sistemində və onun vasitələri ilə yeni forma alan leksik materialın formasız parçasıdır»[84]. Sözalan dildə bu «formasız parça» az və ya çox dərəcədə mənimsənilmə hadisəsinə məruz qalır. Bir qayda olaraq, alınma söz dilin fonetik, morfoloji, leksik-semantik, qrafik, normativ-stilistik və b. səviyyələrində mənimsənilir. Onların mənimsənilmə dərəcələri dilin müxtəlif səviyyələrində eyni deyildir. Məsələn, dildə fonetik səviyyədə mənimsənilmə ilə leksik-semantik səviyyədəki uyğunlaşma müxtəlif şəkildə ola bilər və ya morfoloji mənimsənilmə ilə normativ-stilistik səviyyədə dəyişikliyə uğrama eyni dərəcədə ola bilməz.

Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli alınma sözlər də bu dilə keçdikdə, təbii olaraq dilimizin daxili qanunauyğunluqlarına müvafiq surətdə mənimsənilmə prosesinə məruz qalır. İran mənşəli alınma sözlərin forma və məzmunca dəyişməsi Azərbaycan dilinin daxili inkişaf qanunları ilə müəyyən olunur və leksik-semantik səciyyəsi həmin dilin qanunlarına əsasən dəyişir.

## 2.1. Alınma sözlərin fonetik mənimsənilməsi

Dil əlaqələrinin əsas aspektlərindən biri alınma sözlərin fonetik cəhətdən mənimsənilməsi məsələsidir. Bu hadisə bir dildən digərinə

[84] Sitat üçün bax: Пейсиков. Л.С. Лексикология современного персидского языка. М., 1975, стр.60

söz alınması prosesində mütləq baş verir. «Əcnəbi sözün onun bütün səs cildi, formaları və mənaları ilə dəyişilməz şəkildə alınması faktik olaraq çox nadir hadisədir, əks halda bu, söz alan dilin sisteminin tamam dəyişilməsinə səbəb olardı, ona görə də dilin daşıyıcıları alınma sözlərdəki bəzi məqamları öz dillərindəki adət edilmiş elementlərlə əvəzetmə vasitəsilə yan keçirlər»[85]. Məsələ bundadır ki, alınma sözün «xarici forması»[86] nəinki dəyişir (belə hal müxtəlif fonetik sistemli dillər üçün tamamilə təbiidir), eyni zamanda fonetik əvəzlənmənin müəyyən qanunlarına uyğun olaraq dəyişikliyə məruz qalır. B.A.Serebrennikov bu məsələni daha konkret şəkildə izah edərək göstərir ki, «səslər müxtəlif dillərdə qarmaqarışıq və nizamsız şəkildə deyil, qanunauyğun olaraq dəyişilir. Hər hansı bir dilin, yerli dialektin və hətta şivənin özünəxas fonetik qanunları vardır. Bunun nəticəsində əgər eyni bir söz bir neçə dilə keçibsə, o söz həmin dillərin hər birində müxtəlif fonetik dəyişmələrə uğraya bilər»[87].

Sözlərin bir dildən digərinə keçməsi, həmin dilin fonem vasitələri ilə ifadə olunması, o dildə uzun müddət yaşayaraq onun sisteminə daxil olması iki mərhələdən ibarət prosesdir. Dilçilik ədəbiyyatında bu prosesin mərhələlərinin terminoloji ifadəsində müxtəliflik diqqəti cəlb edir. Rus dilçiliyində bu hadisə "фонетическая адаптация", "фонетическая ассимиляция", "фонетическоеприспособление"[88], "фонетическая субституция", "фонематическая субституция", "фонетическое освоение"[89] və s. terminlərlə adlandırılır. Azərbaycan dilçiliyində də bu məqsədlə "fonetik adaptasiya", "fonetik uyğunlaşma", "fonetik mənimsənilmə"[90] terminləri işlədilir. Bizə elə gəlir ki, leksik alınma prosesinin mərhələlərinin "fonematik əvəzlənmə" və "fonetik

[85] Э.Хауген. Процесс заимствования // Новое в лингвистике, вып.II, М., 1972, стр.349
[86] H.Zərinəzadə. Fars dilində Azərbaycan sözləri. Bakı, 1962, s.62
[87] Sitat üçün bax: H.Zərinəzadə. Göstərilən əsəri, s.77
[88] Еремина К.Н. К проблеме языковых контактов (европеизмы в современном персидском языке). М., 1980, стр.8
[89] Крысин Л.П.Иноязычные слова в современном русском языке. М., 1968, стр.36
[90] Həsənov H.Ə. Müasir Azərbaycan dilinin leksikası. Bakı, 1988, s.141-142; Qarayev A. Azərbaycan dilində Avropa dillərindən alınma sözlər (tarixi-linqvistik tədqiqat). Doktorluq diss., Bakı, 1990, s.21,120

mənimsənilmə” terminləri ilə adlandırmaq daha məqsədəuyğun olardı. Belə bir hal haq qında danışdığımız hadisənin terminoloji ifadəsində də müəyyən aydınlıq yaradardı. Biz ***fonematik əvəzlənmə*** dedik də, əcnəbi sözün daxil olduğu dilin fonem vasitələri ilə ifadəsini nəzərdə tuturuq. ***Fonetik mənimsənilmə*** isə alınma sözün keçdiyi dildə fəaliyyət göstərdiyi müddətdə məruz qaldığı dəyişmələrdir. Beləliklə, fonematik əvəzlənmə ilə fonetik mənimsənilmə bir-birindən fərqləndirilməlidir. Belə fərqləndirmənin əsasında müəyyən fonetik hadisənin sinxron və diaxron planda tədqiqi dayanmalıdır. Əgər fonematik əvəzlənmə eyni vaxtda baş verən aktdırsa, fonetik mənimsənilmə uzun tarixi prosesdir. Bununla yanaşı «həm fonematik əvəzlənmə, həm də fonetik mənimsənilmə leksik alınma prosesinin ayrılmaz tərkib hissələrindən olan sıx əlaqəli hadisələrdir»[91]. Deməli, leksik alınma bir prosesdirsə, bu prosesin birinci fazasını fonematik əvəzlənmə, ikincisini isə fonetik mənimsənilmə təşkil edir.

Məhz bu səbəbdən şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli alınma sözlərin fonetik xüsusiyyətlərindən bəhs edərkən onları iki cəhətdən nəzərdən keçirmək gərəkdir.

1) Azərbaycan və İran dillərinin fonetik sistemlərindəki fərqlərlə bağlı alınma sözlərdə baş verən dəyişikliklər, yəni fonematik əvəzlənmələr.

2) Azərbaycan dilinin və onun müvafiq dialekt və şivələrinin fonetik xüsusiyyətləri ilə əlaqədər alınma sözlərdə baş verən müxtəlif tipli kombinator dəyişmələr.

### 2.1.1. Fonematik əvəzlənmələr

Öncə Azərbaycan və İran dillərinin fonetik sistemlərindəki fərqlərlə bağlı alınma sözlərdə baş verən dəyişiklikləri, yəni fonematik əvəzlənmələri nəzərdən keçirək.

---

[91] Астемирова Б.Б. Фонетическое освоение русских заимствований в кумыкском языке // СТ, 1974, № 2, стр.44

### 2.1.1.1. Saitlər sistemində

Azərbaycan dilinin dialekt və şivələrində işlənən variantları nəzərə almasaq, ədəbi dildə 9 sait səs vardır. Tədqiqat obyektimizə daxil olan İran dillərində isə sait səslərin miqdarı müxtəlifdir [92]. Azərbaycan və İran dillərinin saitlərinin müqayisəsi 1-ci cədvəldə verilir.

Cədvəldən göründüyü kimi, müqayisə edilən dillərin saitlər sistemində səslərin miqdarına görə fərqlər böyükdür. Azərbaycan dilinin saitlər sistemindəki *ö* İran dillərində yoxdur*. Fars dilində ***ı, ü*** saitləri, Talış dilində isə **u** saiti yoxdur. İran dilləri üçün xarakterik olmayan **ı** saiti fars dilindən fərqli olaraq tat və talış dillərində özünə möhkəm yer tutmuşdur. Bəzi tədqiqatçılar İran dillərində **ı** səsinin olmasına türk dilləri ilə qarşılıqlı əlaqələrinin nəticəsi kimi baxırlar[93].

Fars dilindən Azərbaycan dilinə keçmiş sözlərdə sait səslərdə baş verən fonematik əvəzlənmələr barədə prof. A.Axundov ətraflı bəhs etmişdir [94]. Şərq qrupu dialekt və şivələrində işlənən fars sözlərində də həmin səs əvəzlənmələri baş verir. Ona görə də fars dilindən Azərbaycan dilinə keçən sözlərdəki fonematik əvəzlənmələrdən ətraflı bəhs etməyə ehtiyac yoxdur. Lakin bununla belə bəzi fonematik əvzələnmələri qeyd etməyi lazım bilirik.

Məlumdur ki, Azərbaycan dilindən fərqli olaraq, fars dilində **a, i, u** saitləri – həmişə uzun tələffüz edilir. Tərkibində həmin saitlər

---

[92] İran dillərinin fonetik sistemlərindən bəhs edərkən aşağıdakı əsərlərə əsaslanırıq: Гаприндашвили Ш.Г., Гиунашвили Д.Ш. Фонетика персидского языка. Тбилиси, 1964; Расторгуева В.С. Краткий очерк грамматики персидского языка // Миллер Б.В. Персидско-русский словарь. М., 1960; Соколова В.С. Очерки по фонетике иранских языков. Ч.I, М.-Л., 1953; Миллер Б.В. Талышский язык. М., 1953; Hatəmi N.G. Fars dili. I hissə, Bakı, 1984

* Tat dilində *ö* saitinin olmasını Azərbaycan dilinin təsiri ilə izah edirlər. Bax: Hacıyev M. Tat dilinin Qonaqkənd ləhcəsi. Bakı, 1971, s.39

[93] Bax: Zərinəzadə H. Fars dilində Azərbaycan sözləri. Bakı, 1962, s.91; Hacıyev M. Tat dilinin Qonaqkənd ləhcəsi. Bakı, 1971, s.99

[94] Axundov A. Azərbaycan dilinin fonetikası. Bakı, 1984, s.77-79

** Fars dilindəki sözlərin tələffüzündə aşağıdakı lüğətlərə istinad edilmişdir: Б.В.Миллер. Персидско-русский словарь. 3-е изд. М., 1960; Персидско-русский словарь (под ред.А.Рубинчика), т.I, II, 2-е изд. М., 1983

olan alınma sözlər şərq qrupu dialekt və şivələrində uzunluq keyfiyyətini itirir.**

Misallar: **ā** > **ə** : b**ā**rbənd > b**ə**rbənd; bəqər**ā**h > bəqər**ə**h
d**ā**ləngəv**ā**z > d**ə**ləngəvaz;
p**ā**yənd**ā**z> p**ə**yəndaz
**ā**>**a**: bic**ā** > bica; d**ā**məd > damad
q**ā**v > g**a**v; p**ā**yənd**ā**z > pəyənd**a**z;
p**ā**ye > p**a**ya
**ā** >**o**: çəh**ā**rq**ā**v > çərg**o**v
**ī**>**i** : z**ī**və > z**i**və; d**ī**r > d**i**r; dəstk**ī**re > dəsk**i**rə
**ū** >**i** : p**ū**stkənde > p**i**skəndə; p**ū**rkar > p**i**rkar
qāvəng**ū**r > gavang**i**r
**ū**>**u** : dor**ū**ğ > dur**u**ğ; behb**ū**d > beyb**u**t
əmb**ū**r > amb**u**r
**ū** >**ü** : sərneq**ū**n > sərnig**ü**n; c**ū** > c**ü**

Misallardan göründüyü kimi, fars dilindəki uzun saitlər Azərbaycan dilində uzunluq keyfiyyətini itirirlər. Lakin dialekt və şivələrdə işlənən bəzi sözlərdə həmin saitlərin uzunluq keyfiyyətini saxlaması müşahidə edilir. Belə sözlərin miqdarı məhduddur. Məsələn:

**ā** > **ā** : **ā**bī > **ā**bi; b**ā**zū > b**ā**zu; b**ā**həm > b**ā**həm
gir**ā**mi > gir**ā**mi
**ū** > **ū** : bīr**ū**nī > bir**ū**ni

Fars dilindəki adi kəmiyyətli saitlər dialekt və şivələrdə işlənən tat və talış dilindən alınma sözlərdəki saitlərlə eyni dəyişikliklərə məruz qalır. Onlar barədə aşağıda yeri gəldikcə danışılacaq.

Tat və talış dillərindən alınma sözlərdə aşağıdakı fonematik əvəzlənmələr müşahidə edilir.

1) **a** səsi dialekt və şivələrdə **ə** ilə əvəzlənir. Bu əvəzlənməyə söz ortasında kar samitlərdən (**s, ç, x**) sonra, **m, n, r** sonorlarından əvvəl təsadüf olunur: sarf > sərf; çanqori > çəngüri; xarxar > xərxər; zardinə > zərdənə; qamijə > qəmijə.

2) İran dillərində **ə** saiti dialekt və şivələrimizdə bir çox hallarda **a** ilə əvəzlənir. Bu əvəzlənmə söz ortasında və sonunda sistem halında müşahidə olunur: qağlə > qağla; daməd > damad; dancə > danca; dəhar > dahar; eyhanə > eyhana; latə > lata; moləvon >

malavan; sərəvan > saravan; tamazə // tamasə > tamaza // tamasa; xarə > xara.

Misallardan görünür ki, **ə** > **a** əvəzlənməsi saitlər ahənginin nəticəsi olaraq meydana çıxır. Həmin əvəzlənməyə digər türk dillərində işlənən İran mənşəli alınma sözlərdə də rast gəlinir[95].

3) İran mənşəli sözlərdə **e** dialekt və şivələrdə **a, ə, i, ö, u** səsləri ilə əvəzlənir.

a) **e** > **a** : Bu əvəzlənməyə əsasən söz sonunda rast gəlmək olur ki, bu da saitlər ahənginin nəticəsidir, məsələn, balaxan**e** > balaxan**a**, çarpar**e** > çarpar**a**, paç**e**bənd > paç**a**bənd.

b) **e** > **ə** : Bu əvəzlənmə əsasən fars sözlərində söz sonunda müşahidə edilir. Məsələn, dobar**e** > dübar**ə**, dəstgir**e** > dəsgir**ə**, cərid**e** > cəlid**ə**, pərənd**e** > pərənd**ə**, setiz**e** > sitiz**ə**.

c) **e** > **i** : Bu səs əvəzlənməsinə çox az miqdarda sözün tərkibində rast gəlinir: sərn**e**qun > sərn**i**gün, s**e**tize > s**i**tizə, t**e**ləkeşniş > t**i**ləkeşniş.

ç) **e** > **ö** : Bir sözdə təsadüf edilib: bırg**e**z > bürgöz.

d) **e** > **u** : Təkcə xor**e**ş > xur**u**ş sözündə müşahidə edilib. **e** > **u** əvəzlənməsinə başqa türk dillərində də həmin sözdə rast gəlinir[96].

4) Talış dilindən alınma sözlərdə **ı** səsi dialekt və şivələrdə **i, ü** ilə əvəzlənir.

a) **ı** > **i** : bınəkə > b**i**nəkə, bılanq > b**i**ləng, qırd > k**i**rt, lınqə > l**i**ngə, mıj > m**i**c, sıv > s**i**v və s.

b) **ı** > **ü** : bırqez > b**ü**rgöz, кırıj > k**ü**r**ü**nc.

5) İran dillərindən alınma sözlərdə **o** səsi şərq qrupu dialekt və şivələrində **a, u, ə, ü** səsləri ilə əvəzlənir.

a) **o** > **a** : Bu əvəzlənmə talış və tat dillərindən alınma sözlər üçün ən xarakterik hadisələrdən biridir: b**o**fə > b**a**fa, qələv**o**n > qələv**a**n, m**o**ləv**o**n > m**a**lav**a**n, ənc**o**mə > ənc**a**mə, l**o**s > l**a**s, ç**o**m**o**xudun > c**a**m**a**xudan, dəh**o**r > dah**a**r, qər**o**p > gər**a**f və s.

b) **o** > **u** əsasən sözlərin birinci hecasında baş verir. Məsələn, x**o**reş > x**u**ruş, q**o**ra > q**u**ra, d**o**ruğ > d**u**ruğ.

---

[95] Джафаров Дж. Персидские слова в современном туркменском литературном языке. АКД, Ашхабад, 1971, стр.11; Насыров Х. Таджикско-персидские заимствования в уйгурском языке. АКД, Ташкент, 1972, стр.30,31

[96] Джафаров Дж. Персидские слова в современном туркменском литературном языке. АКД, Ашхабад, 1971, стр.11

c) **o** > **ö** əvəzlənməsi dilarxası **к**-nın dialekt və şivələrdə dilortası **k** samitinə keçməsi ilə baş verir: lок > l**ö**k, l**о**кü > l**ö**kü, к**о**sara > k**ö**sərə.

ç) **o** > **ü** əvəzlənməsi əsasən sözlərin birinci və ikinci hecasında müşahidə edilir. Məsələn, d**o**bare > d**ü**barə, çanq**o**ri > çəng**ü**ri, bəds**o**luк > bəds**ü**lük.

6) Talış dilindən alınma sözlərdə **ü** səsi dialekt və şivələrdə **i**, **ü** səsləri ilə əvəzlənir.

a) ü > **i** : p**ü**lə > p**i**lə, l**ü**ləpər > l**i**ləpər.

b) ü > **u** : qod**ü**ş > qod**u**ş, h**ü**şə > h**u**şə, h**ü**l**ü** > h**u**l**u**.

7) Tat dilindən alınma sözlərdəki **o**$^{-u}$ diftonqu dialekt və şivələrdə ya **ov** səs birləşməsi ilə özünü göstərir, ya da diftonqun ikinci elementinin düşməsi ilə sait uzanması baş verir: t**o**$^{-u}$ > t**ov**, g**o**$^{-u}$ dan > g**ō**dan, t**o**$^{-u}$ keş > t**ō**keş.

### 2.1.1.2. Samitlər sistemində

Azərbaycan və İran dillərinin konsonantizmini müqayisə edərkən (2-ci cədvələ bax) onların arasında çox böyük fərq olmadığı aşkar olunur. Fars dilindəki boğaz [‘] samiti istisna olmaqla bütün digər samitlərin Azərbaycan dilində fizioloji-akustik qarşılığı vardır[97]. Tat dilindəki boğaz «ayn» və emfatik «h» səsləri onu müasir İran dillərinin çoxundan fərqləndirir. Talış dilində dilortası **k** və **g** səsləri yoxdur.

Fars dilindən Azərbaycan dilinə keçmiş sözlərdəki samit səs əvəzlənmələri barədə prof. A.Axundov bəhs etdiyinə görə[98], biz dialekt və şivələrdə işlənən tat və talış sözlərindəki samit əvəzlənmələrinə diqqət yetirəcəyik.

1. İran dillərindən alınma sözlərdə **q** səsi dialekt və şivələrimizdə **g** ilə əvəzlənir. Bu əvəzlənmə söz əvvəlində və ortasında ön sıra sait səslərindən əvvəl və **n** sonorundan sonra müşahidə edilir: **q**ırd > **g**ird, **q**odüş > **g**ödüş, **q**əzənə > **g**əzənə, **q**iv > **g**iv, dən**q**ənə > dən**g**ənə, zın**q** > zin**g**, çan**q**ori > çən**g**üri.

---

[97] Axundov A. Azərbaycan dilinin fonetikası. Bakı, 1984, s.191
[98] Yenə orada, s.191-192

2. İran dillərindən alınma sözlərdə **j** səsi dialekt və şivələrimizdə bütün vəziyyətlərdə bir qayda olaraq **c** ilə əvəzlənir, məsələn: **j**iə > **c**iyə, **j**o**j**u > **c**ə**c**u, və**j**ələ > və**c**ələ, qə**j**ələ > qə**c**ələ, hə**j**in > hə**c**in, mi**j**ə > mi**c**ə, ti**j** > ti**c**.

3. İran dillərindən alınma sözlərdə dilarxası **к** dlialekt və şivələrdə bəzən dilortası **k** ilə əvəzlənir. Bu hal əsasən söz əvvəlində müşahidə olunur. Məsələn: **к**əjələ > **k**əcələ, **к**unə > **k**unə, **к**ərənay > **k**ərənay, **к**əşivan > **k**əşivan//**k**əşəbin, **к**əmən > **k**əmən, **к**ındə > **k**ündə.

Azərbaycan və İran dillərinin fonetik sistemləri ilə bağlı alınma sözlərdə baş verən fonematik əvəzlənmələr topladığımız materiallara əsasən göstərilən hallardan ibarətdir.

### 2.1.2. Kombinator əvəzlənmələr

İndi isə Azərbaycan dilinin və onun şərq qrupu dialekt və şivələrinin xüsusiyyətləri ilə əlaqədar olaraq alınma sözlərdə baş verən dəyişiklikləri nəzərdən keçirək.

Şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli alınma sözlərdə yuxarıda qeyd edilən fonematik əvəzlənmələrdən başqa bir sıra kombinator səciyyəli dəyişikliklər baş verir. Bu dəyişikliklər Azərbaycan dilinin və onun şərq qrupu dialekt və şivələrinin xüsusiyyətlərini əks etdirir. Aşağıda haqqında danışılacaq dəyişmələr alınma sözlərin şərq qrupu dialekt və şivələrində mənimsənilməsini daha aşkar göstərir. Həmin dəyişmələri aşağıdakı qaydada nəzərdən keçirmək məqsədəuyğundur.

#### 2.1.2.1. Söz əvvəlində baş verən kombinator dəyişmələr

Sözlərin əvvəlində baş verən kombinator dəyişmələr həm sait, həm də samit səsləri əhatə edir.

1. Söz əvvəlində saitlərlə bağlı baş verən kombinator dəyişmələrdən biri alınma sözlərə əlavə saitin artırılması – proteza hadisəsidir. Proteza hadisəsi iki halda baş verir.

a) Azərbaycan dilində (eləcə də digər türk dillərində) söz əvvəlində qoşa kar samitin işlənməsi tələffüz üçün çətinlik

törətdiyinə görə əlavə sait artırılır. Məsələn: *istil//isdil*, «ölçü qabı, ölçü vahidi» (J., Ln), *üstel // ustel*, «yabanı bitki adı» (M.) və s.

b) Azərbaycan dilində (eləcə də digər türk dillərində) **r** ilə başlanan sözlərin önünə protetik sait əlavə edilir. Məsələn: *irəd*, «ləpir, iz» (J.), irəşənə «rişə, kök» (Q.), *iriz*, «cığır, iz, ləpir», *irik* «saxsı ovuntusu» (Q.) və s.

2. Söz əvvəlinə samit artırılması. Şərq qrupu dialekt və şivələrində alınma sözlərə aşağıdakı samitlərin artırılması müşahidə olunur:

***h səsinin artırılması:*** Alınma sözlərə **h** səsinin artırılması **a**, **ə** saitlərindən əvvəl özünü göstərir; məsələn, **h**ərə «böyük əl mişarı» (Ln.), **h**ərəxana «taxta çəkilən yer» (C.), **h**əvəndə // **h**əvəndənə «xışda istifadə edilən gön qayış», hanqıl «tor toxunan hana» (Ln.) və s.

***l səsinin artırılması:*** Bu hadisə bir sözdə müşahidə edilmişdir: abgərdən > **l**əbgərdən (Ş.).

3. Söz əvvəlində samitlərin yerdəyişməsi – metateza hadisəsinə alınma sözlərdə iki halda rast gəlinmişdir:

a) yanaşı samitlərin yerdəyişməsi

rübənd > ürbənd, rısa > irsə//ırsa (Q.).

b) yanaşı olmayan samitlərin yerdəyişməsi

mindar//mindər < nimdar «döşəkcə» (Q., Ln.) lamça < nalça «döşəkcə» (J.) mintənə < nimtənə «qadın geyimi» (B.) və s.

### 2.1.2.2. Söz ortasında baş verən kombinator dəyişmələr

Söz əvvəlində olduğu kimi, söz ortasında baş verən kombinator dəyişmələr həm saitləri, həm də samitləri əhatə edir.

1) Saitlərlə bağlı kombinator dəyişmələrdən biri epentezadır. Azərbaycan dilində (o cümlədən başqa türk dillərində) söz ortasında epentetik saitin artırılmasına səbəb mahiyyət etibarı ilə samitlərin yanaşı işlənməsi zamanı ortaya çıxan tələffüz çətinliyidir. Epentetik sait həmin tələffüz çətinliyini aradan qaldırır. Epentetik saitin işlənməsinə söz vurğusu da müəyyən təsir göstərir: *məzərə > məzrə* (< *mərz*) «sərhəd, nişan» (Q.); *süxura < sukra // sokrə* «badya, çini qab» (Ln., Q.), *isbirə < sibrə* «bitki xəstəliyi» (Ab.); *xışım < xışm* «hirs, qəzəb; sürət» (Ln.).

Alınma sözlərdə saitin düşməsi – eliziya hadisəsinə də təsadüf edilir. Eliziya hadisəsi əsasən sonorlardan əvvəl və ya sonorla novlu samitlərin arasında baş verir; məsələn: *adna* < *adinə* «cümə axşamı, cümə» (Ş.), *gəznə // geznə* < *qəzənə* «gicitkan» (İ., Ln., M.) və s.

2. Alınma sözlərdə samitlərin düşməsi hadisəsi baş verir. Aşağıdakı samit düşməsi müşahidə olunur.

***t sәsinin düşməsi***: *dəsgirə* < dəs**t**girə «səbət» (B.), *dəsbəcə* < dəs**t**paçe «əlüstü, dərhal» (J.), *masqur//masqura* < mas**t**xor «balaca kasa», *dəsəçin* < dəs**t**əçin «əllə dərilmiş» (Ln., M.).

Misallardan göründüyü kimi, həmin sözlərdə **t** səsinin düşməsinin səbəbi iki və ya üç kar samitin söz daxilində yanaşı işlənə bilməməsidir. Belə alınma sözlərdə **t** səsinin düşməsi başqa dialekt və şivələrimizdə[99] və eləcə də başqa türk dillərində müşahidə edilir.

***h səsinin düşməsi***: Söz ortasında **h** səsinin düşməsi geniş yayılmış hadisələrdən biri kimi ən çox alınma sözlərdə müşahidə edilir. Məsələn, *bəli* < bə**h**li «gilas» (Q.), *dəyek* < də**h**yek «vergi» (Ab.), *dəmərdə* < də**h**mərdə «iri boşqab», «dərin boşqab» (Ab., B., Q., Əb., Ln.), *siyapır // siyafur* < siya**h**pur «utanmaz, həyasız, sırtıq» (Ab., B., Q., Əb., C., Ş.), *şacu* < şa**h**cu «baş suayrıcı» (Ab.), *şubənd* < şa**h**bənd «yundan toxunma çarıq bağı» (Q.), *şamayı* < şa**h**mahi «balıq növü» (Sal., S., C.).

***n səsinin düşməsi***: Alınma sözlərdə **n** səsinin düşməsi çox az sözdə müşahidə edilmişdir. Məsələn: *nōxarış* «yavanlıq» (Ab., B.), *pərsəg* «tərəzinin gözlərini bərabərləşdirmək üçün istifadə edilən xırda daş» (ƏB., S., Sal.).

3. Alınma sözlərdə metateza hadisəsi. Alınma sözlərdə metateza hadisəsi həm yanaşı işlənən, həm də yanaşı olmayan samit səslərdə baş verir.

*namətgan* < naməkdan «duz qabı» (Y.), *əybərdən* [100] < abgərdan (B.), g*əndərbənd* < gərdənbənd «xamut» (Sal.) və s.

---

[99] Мамедов М.А. Тебризский диалект азербайджанского языка. Канд. дисс., Баку, 1989, стр.60

[100] Şirəliyev M. Bakı dialekti, s.44

### 2.1.2.3. Söz sonunda baş verən kombinator dəyişmələr

Şərq qrupu dialekt və şivələrində alınma sözlərdə söz sonunda baş verən kombinator dəyişmələr söz əvvəlində və ortasında olduğu kimi çox geniş yayılmamışdır. Sözlərin sonunda aşağıdakı kombinator dəyişmələr müşahidə edilir.

1. Söz sonunda epentetik saitin işlənməsinə bir neçə sözdə rast gəlirik. Məsələn: *bekara* «nahar, lazımsız» (Y.), *ləvərə* «gücsüz, arıq» (Q., Y., Ln., Y., BR), *məzrə* «ayırıcı nişan» (A., B., L.), *tünəкi* «nazik», «həssas» (Ab., B., İ.).

2. Söz sonunda samit artırılması da az yayılmışdır. Bir sözdə **v,** bir sözdə isə **h** səsinin artırılması qeyd olunmuşdur.

*qilindov//qılındov* < qilində «boyunbağı» (Q.), g*icəh* «gənə» (Q.).

3. Söz sonunda samit düşümü.

***t səsinin düşməsi***: *püşraz* < pişrəs**t** «üzüm növü» (B.), *nimras* < nimrəs**t** «yarımçıq yetişmiş» (B.), *zəbərdəs* < zəbərdəs**t** «güclü, qüvvətli» (Ln., M., Q., B., C.), *şirəpus* < şirəpus**t** «divarı ağartmaq üçün dəri» (B., Ln., Ş.).

***h səsinin düşməsi***: *taskülа* «araqçın» (B.), *şəbkülа // şəbkülə // şəbkula* «keçə papağı» (B., M., C.).

Şərq qrupu dialekt və şivələrində alınma sözlərdə yuxarıda qeyd edilmiş fonetik hadisələrdən əlavə, assimilyasiyaya da rast gəlinir. Bu fonetik hadisə həm söz köklərində, həm də kök və şəkilçi arasında müşahidə olunur. İran mənşəli alınma sözlərdə irəli assimilyasiya geniş yayılmışdır. Məsələn:

*beddam* < bədnam (AB., B.);

*dəssək* < dəstək «qulluğa göndərilə bilən uşaq» (A., M., C.);

*dassar* < dəstar «əl dəyirmanı» (bütün dialekt və şivələrdə);

*banıssan* < banıstan «qoyun-quzu saxlanan üstüörtülü yer» (B., Ş.);

*pessayi* < pesdehi «ehtiyat azuqə» (Ab., B.);

*ressə* < restə «2-3 kiloqramlıq bağlı soğan dəstəsi» (Y.) və s.

Alınma sözlərdə kök və şəkilçi arasında da irəli assimilyasiya hadisəsi müşahidə olunur. Məsələn: *daharrığ* «təpəlik» (B., Q.), *gərdənnik* «boyunbağı» (S.), *siyapurrıq // siyapırrıq // siyafurruq* «utanmazlıq, həyasızlıq» (B., Q., ƏB.).

Geri assimilyasiyaya az təsadüf edilir: *dambul* < danbul «gavalı növü» (B., Ln.), *rəvə-rüvə* < ləvə-rüvə «içalat» (A., Ln., M.), *nona* < lonə «yuva» (Ln., C.).

## 2. 2. Alınma sözlərin morfoloji mənimsənilməsi

Alınma sözlərin morfoloji cəhətdən mənimsənilməsi dil əlaqələri ilə bağlı əsas cəhətlərdən biridir. Belə ki, əcnəbi dil elementlərinin söz alan dilin sisteminə təsiri, sözalan dilin yad elementlərə nə dərəcədə müqavimət göstərməsi, alınmaların mənimsənilməsi prosesinin istiqaməti, alınma prosesində və ondan sonrakı dövrdə dəyişmələrə məruz qalmış sözlərin təsnifatı məsələlərinin öyrənilməsi vacibdir.

Alınma sözün sözalan dildəki (qrammatik) formasının onun mənbə dildəki çıxış halına (alınmaya qədər olan hal nəzərdə tutulur—T.İ.) qrammatik cəhətdən uyğun gəlib-gəlməməsi qarşılıqlı əlaqədə olan dillərin genetik qohumluq və tipoloji oxşarlıq dərəcəsindən asılıdır.

Azərbaycan dilinə keçmiş İran mənşəli alınma sözlərin morfoloji mənimsənilməsi ilə bağlı məsələlər Azərbaycan və İran dillərinin strukturca bir-birindən fərqlənən müxtəlif tipoloji qruplara mənsub olması səbəbindən xüsusi əhəmiyyət kəsb edir.

Bəllidir ki, İran dilləri morfoloji quruluşuna görə flektiv olan Hind-Avropa dilləri ailəsinə daxildir. Azərbaycan dili aqlütinativ quruluşlu türk dillərindəndir. Aqlütinasiya isə söz kökünə müəyyən ardıcıllıqla müxtəlif şəkilçilərin artırılması prosesidir.

Azərbaycan dilində sözyaratma və sözdəyişmə sözün kökünə müəyyən qrammatik məna ifadə edən xüsusi hissəciklər – şəkilçilər artırılması ilə baş verir. Buna görə də aqlütinativ dillərdə, o cümlədən Azərbaycan dilində söz yaradıcılığında suffiksal forma geniş inkişaf etmişdir.

İran dillərində də morfoloji yolla söz yaradıcılığı geniş yayılmışdır. Lakin müqayisə edilən dillərdə morfoloji yolla söz yaradıcılığı bir-birindən fərqlidir. Belə ki, Azərbaycan dilindən fərqli olaraq İran dillərində söz yaradıcılığında iştirak edən sözdüzəltmə vasitələri sözün önünə, ortasına və sonuna əlavə edilir. Azərbaycan dilində isə, yuxarıda qeyd edildiyi kimi, həmin vasitələr

sözlərin sonuna əlavə olunur. Azərbaycan və İran dillərininin morfoloji quruluşunun müxtəlifliyi İran dillərindən alınma sözlərin morfoloji mənimsənilməsi prosesinə təsir göstərir. Azərbaycan dilinin aqlütinativ xarakteri İran dillərindən alınma sözlərin struktur-semantik və sintaktik mahiyyətinin mənimsənilməsi prosesini tənzimləyir. Alınma sözlərin morfoloji mənimsənilməsini aşkarlamaqdan ötrü onları nitq hissələrinin tərkibində nəzərdən keçirmək məqsədəuyğundur.

### 2.2.1. İsim

Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli alınma sözlər qrammatik mənsubiyyəti baxımından müxtəlif nitq hissələrini əhatə edir. Alınma sözlər arasında əsas yeri isimlər tutur. Onlar konkret predmet və anlayışları bildirir və buna görə də daha asan şəkildə başqa dilə keçə bilir.

İran mənşəli alınma sözlərin Azərbaycan dilinin dialekt və şivələrinə ancaq təkdə işlənən formada keçməsi müşahidə edilir.

Azərbaycan dilində alınma isimlərin struktur xüsusiyyətləri də maraq doğuran məsələlərdəndir. Genetik qohumluq və tipoloji uyğunluq cəhətdən müxtəlif dil ailələrinə mənsub olmalarına baxmayaraq, Azərbaycan və İran dillərində isimlərin, daha ümumi götürsək, sözlərin morfoloji strukturu sadə, düzəltmə və mürəkkəb olmaqla eynilik təşkil edir. Lakin sözlər bir dildən başqa dilə keçdikdə mənbə dildəki morfoloji strukturu ilə keçdiyi dildəki halı uyğun gəlməyə bilər. «Başqa dillərdən keçmiş istər düzəltmə və istərsə mürəkkəb sözlər… o zaman düzəltmə və mürəkkəb sözlər kimi qəbul etmək olar ki, həmin sözlərin tərkibində iştirak edən leksik vahidlər bu dildə də ayrıca leksik vahid kimi işlənmiş olsun, eyni zamanda düzəltmə sözləri əmələ gətirən ünsür dilimizdə bir çox sözləri əmələ gətirə bilən şəkilçi kimi özünü göstərə bilsin»[101]. Deməli, sözlərin İran dillərindəki morfoloji quruluşunun Azərbaycan dilinə keçəndən sonra saxlaması üçün, hər şeydən əvvəl tərkib hissələrinin Azərbaycan dilində ayrılıqda işlənməsi cəhəti əsas şərtlərdəndir.

[101] Cəfərov S. Azərbaycan dilində söz yaradıcılığı. Bakı, 1960, s.12

***Domə, dəsgirə, zərdi, mürgənə, noxarış*** və s. sözlər İran dillərində morfoloji struktur baxımından düzəltmə və mürəkkəb isimlərdir. Lakin belə sözləri Azərbaycan dilində düzəltmə və ya mürəkkəb isimlər kimi qəbul etmək olmur. Belə ki, həmin sözləri tərkib hissələrinə ayırdıqda mənası olmayan səslər yığını təsiri bağışlayır. Elə sözlər də vardır ki, tərkib hissələrindən biri Azərbaycan dilində müstəqil işlənir, digəri isə işlənmir. Belə halda yenə həmin sözlərin ayrılıqda işlənməyən hissəsini morfoloji struktur baxımında müstəqil qəbul etmək olmur; məsələn: ***vurmabizən*** «qarışıqlıq, hay-küy», ***sərxeyir*** «məclisi idarə edən şəxs» və s.

Bu xüsusiyyətləri nəzərə alaraq Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində işlənən alınma isimləri morfoloji strukturuna görə aşağıdakı kimi qruplaşdırmaq olar:

### 2.2.1.1. Sadə isimlər

İran dillərindəki strukturu baxımından belə isimlər Azərbaycan dilində aşağıdakı qruplara ayrılır:

I. Azərbaycan və İran dillərində sadə quruluşa malik isimlər; məsələn: ***adına // adna*** «cümə axşamı, cümə» (Br., Y., Ln., Sal.), ***ambur*** «kəlbətin» (B.), ***beybut*** «xəncərə oxşar iri kəsici alət» (B., Q.), ***vel*** «ayıdöşəyi» (A., Ln., Lk., M.), ***vəzəx*** «qurbağa» (Ln., M.), ***zivə // züvə*** «paltar sərilən ip» (B., Ln.), ***mədd*** «meyvə şirəsi» (A., Lk., Ln.), ***siv*** «künc» (M.), ***sos*** «çil, yazqabağı üzdə əmələ gələn ləkə» (A., Ln., M.), ***xuruş*** «acıq, qəzəb» (Ab., B., Q., Y.), ***çin*** «oraq» (Q., Ln., Y.), ***tığ*** «balığın tikanı» (B., Y., ln.), ***çəp*** «avar» (Ln., Sal.), ***car // şor*** «sığırçın» (Ab., Ln., M.), ***şıp*** «səbət» (A., Ln.) və s.

II. İran dillərində düzəltmə isimlər Azərbaycan dilində sadə isimlər hesab edilir; məsələn:

***biruni*** «bayır imarət» (B.) – birun «xaric, çöl», **-i** sözdüzəldici şəkilçi;

***zərdi*** «sarılıq» (B., Q., Ln.) – zərd «sarı», **-i** sözdüzəldici şəkilçi;

***isbirə*** «xəstəlik adı» (Ab., Q., C.) – isbi «ağ», **-r-** bitişdirici ünsür, **-ə** sözdüzəldici şəkilçi;

***güşə//guşə*** «çarıqbağı keçirilən yer» (Г.) – güş//guş «qulaq», **-ə** sözdüzəldici şəkilçi;

***gərdə//gərde*** «saman xırdası» (Ab., Q.) – gərd «toz», **-ə** şəkilçi;

***qandımə*** «itdirsəyi» (Ln.) – qandım «buğda» **-ə** şəkilçi və s.

İran dillərində düzəltmə olan bu isimlərin çoxunun nə kökü, nə də şəkilçisi Azərbaycan dilində müstəqil işlənmir, bəzilərinin kökü ayrılıqda işlənsə də, şəkilçi sözyaradıcılığında iştirak etmir. Bu səbəbdən onlar Azərbaycan dilində sadə isimlər hesab olunur.

III. İran dillərində mürəkkəb isimlər Azərbaycan dilində sadə isimlər hesab olunur. Aşağıdakı isimlərin İran dillərində morfoloji strukturuna nəzər salaq:

***belləgilə*** «palıd ağacının qozası, toxumu» (Ln., M.) – bəlel «palıd», **-ə** sifət düzəldən şəkilçi, gilə < qılə «qoza»;

***bərbənd*** «yorğan-döşək yığılan parça» (B.) – bər < bar «yük», bənd < bästən felinin kökü;

***balbır*** «suya batmamaqdan ötrü tora bağlanan taxtalar» (S.) – bal «qanad», bır < pər;

***bürgez // bürgöz*** «tikandan düzəldilən süpürgə» (Sal.) – bür < bır «tikan», göz < qezı «süpürgə»;

***qəmijə*** «səpki (istidən)» (Ln.) – qəm < qam «isti», **-i-** bitişdirici ünsür, jə «je» (vurmaq) felinin keçmiş zaman feli sifəti;

***gərməgiyo*** «qurda qarşı suyu içilən ot» (Q.) – gərm < kərm «qurd» **-ə-** bitişdirici ünsür, giyo «ot»;

***səngisitarə*** «ulduz daşı» (Lk.) – səng «daş», **-i-** izafət şəkilçisi, sitarə «ulduz» və s.

İran dillərində bu isimlərin mürəkkəb quruluşa malik olması aydın görünür. Lakin Azərbaycan dili stixiyası onları həmin formada qəbul edə bilmir, çünki onların komponentləri Azərbaycan dilində müstəqil işlənmir. Bu səbəbdən həmin sözlər Azərbaycan dilində sadə isimlər hesab edilir.

### 2.2.1.2. Düzəltmə isimlər

Dialekt və şivələrdə İran mənşəli alınma sözlərdən yaranan düzəltmə isimləri aşağıdakı şəkildə nəzərdən keçirək.

**I.** KÖK $_{\text{İran}}$ + ŞƏKILÇI $_{\text{İran}}$

Bəllidir ki, İran dillərindən şəkilçilər Azərbaycan dilinə birbaşa deyil, ancaq qoşulduğu sözün tərkibində keçmişdir. Alınma sözlərin

tərkibində dilimizə keçən şəkilçilərin heç də hamısı söz yaradıcılığında fəal iştirak etmir, yəni Azərbaycan dilinin sisteminə sözyaradıcı ünsür kimi daxil ola bilmir. Ona görə də həmin şəkilçilərlə birlikdə İran dillərində düzəltmə quruluşa malik olan sözlər Azərbaycan dilində sadə sözlər kimi qavranılır. Bu haqda dissertasiyanın «Sadə isimlər» bəhsində danışılmış və kifayət qədər misallar göstərilmişdir. Burada isə dilimizdə söz yaradıcılığında iştirak edən İran mənşəli şəkilçilərdən danışılacaq. Dialekt və şivələrdə düzəltmə isimlərin yaranmasında iştirak edən İran mənşəli şəkilçilər Azərbaycan ədəbi dilində də işlənir. Şərq qrupu dialekt və şivələrində düzəltmə isimlərin əmələ gəlməsində aşağıdakı İran mənşəli alınma şəkilçilərdən istifadə olunur.

1. ***-ban (-van, -von)***. Alınma sözlərə əlavə edilən bu şəkilçi *müəyyən bir işi görən adam* məzmunu ifadə edir. Geniş yayılmamışdır; məsələn: ***gələvan*** «naxırçı» (Ln., M.), ***maləvan // moləvon*** 1. «tarla qaravolçusu, qoruqçu» (Ln.), 2. «naxırçı» (Y.), ***tumcarban*** «çəltik sahəsinin qarovulçusu» (A., Ln., M.).

2. ***-dan*** *və onun variantları*. Bu şəkilçi sözlərə əlavə olunaraq «yer», «qab» mənasını ifadə edir; məsələn: ***goudan*** «tövlə» (Ab., B.), ***cəməxodan*** «yük yeri» (M.), ***cumaxatan*** «yorğan-döşək yığılan taxca» (Ab., B.), ***nəməkdan // məməkdan*** «duz qabı» (İ.), ***ovdan*** «nohur» (Ln.).

3. ***-dar***. Fars dilində müstəqil mənaya malik olan bu söz şəkilçi kimi dilimizə çox əvvəllərdən məlumdur: təsərrüfatçı, müəyyən bir peşənin sahibi mənalarını ifadə edir[102]; məsələn: ***binəkdar*** «keçmişdə topdansatışla məşğul olan tacir» (B.), ***sağirdar*** «yetim uşağı olan adam» (Ln., M.), ***çərəydar*** «çəki ölçən adam» (Y.), ***cumadar*** «hamamda qulluq edən adam» (Ab.) və s.

4. ***-keş***. İran dillərində müstəqil mənaya malik sözdür. Azərbaycan dilində şəkilçiləşmişdir. Dialekt və şivələrdə sadə sözlərə qoşularaq onlardan müxtəlif məna ifadə edən düzəltmə isimlər əmələ gətirir; məsələn: ***dəmkeş*** «qazan, samovar və s. şeylərin ağzına qoyulan qapaq» (Ab., B., Q.), ***pencəkeş*** «təndir çörəyi, lavaş» (Br., ƏB., Y.S.), ***toukeş*** «buxarı trubası» (Ab., B., Q.), ***çəpkeş*** «avarçəkən» (Sal.) və s.

---

[102] Mirzəzadə H. Azərbaycan dilinin tarixi qrammatikası. Bakı, 1991, s.67

5. ***-xana***. İran dillərində müstəqil mənalı sözdür. Azərbaycan dilində şəkilçiləşmişdir. Dialekt və şivələrdə qoşulduğu sözdə «yer» məzmunu ifadə edir: ***otəşxana*** «samovarın odluğu» (Ln., M.), ***ərəxana*** «taxta çəkilən yer» (Y., Lk.).

**II.** KÖK $_{\text{İran}}$ + ŞƏKILÇI $_{\text{Azərb.}}$

Dilimizin leksik-qrammatik qanunlarına tabe olan İran mənşəli sözlər Azərbaycan dilinin öz şəkilçilərini qəbul edərək yeni isimlərin yaranmasında fəal iştirak edir. Dialekt və şivələrdə alınma sözlər əsasında yeni düzəltmə isimlərin yaranmasında Azərbaycan dilinin məhsuldar şəkilçiləri iştirak edir. Bu şəkilçilər aşağıdakılardır:

***-lıq, -lik*** və onun fonetik variantları; məsələn: ***biçizdik*** «pulsuzluq» (B., Ln.), ***daharrığ*** «təpəlik» (Ab., B., Q.), ***kəmlik*** «əskiklik» (B., Y.), ***gərdənnik*** «boyunbağı» (S.), ***siyapırrıq // siyafurruq*** «utanmazlıq» (B., ƏB.), ***tumcarlıq*** «çəltik şitili əkilən sahə» (A., Ln., M.), ***çüpəlik*** «kolluq» (Y.), ***canəzirlik*** «xəstəlik» (Ş.), ***şətəllik*** «nadinclik» (B., Ln., M.).

***-çi***: ***ərəçi*** «taxta çəkən» (B., Lk., C.), ***miyançi*** «ara düzəldən, vasitəçi» (B., Lk., Q.), ***rədçi*** «iz götürən» (Y.), ***çəpçi*** «avarçəkən» (Ln., Sal.) və s.

***-ça, -çə***. Bu şəkilçi qoşulduğu sözdə kiçiltmə məzmununu yaradır; məsələn: ***dərçə*** «balaca taxça» (B.), ***kəmçə*** «kiçik xəlbir» (Q., Sal.), ***nalça*** «döşəkçə» (Ln., M., Y.), ***nimdarçə*** «döşəkçə» (Q., Ln.), ***səkçə*** «bardaq» (S., Sal.).

***-cığ, -cik***. Bu şəkilçi də alınma sözlərdə kiçiltmə mənasını bildirir: ***domujacıq*** «kiçik əl toru» (A., Ln., M.), ***sigezicik*** «kiçik kisə» (Y.) və s.

### 2.2.1.3. Mürəkkəb isimlər

Əgər alınma sözlərin tərkib hissələri Azərbaycan dilində və onun dialekt və şivələrində müstəqil leksik vahid kimi işlənirsə, onları mürəkkəb isimlər kimi qəbul etmək olar. Alınma sözlər hesabına yaranan mürəkkəb isimlər tamamilə Azərbaycan dilinin qrammatik qanunlarına tabe olur, yəni mürəkkəb sözlərin

komponentləri arasında sintaktik əlaqələr Azərbaycan dilinin qayda-qanunlarına əsaslanır. Dialekt və şivələrimizdə mürəkkəb isimləri aşağıdakı kimi təsnif etmək olar.

1.Komponentlərinin hər ikisi alınma sözlərdən ibarət olan mürəkkəb isimlər: ***əmbərəcu//əmbərcü*** «tağların arasını sulamaq üçün kiçik su yolu» (Sal.), ***bijən-bijən*** «vurhavur» (Y., Ln., M.), ***küdülpaça*** «gödək» (Ln.), ***püştəbənd // püşdəvan//püşdəban*** «divarın arasına qoyulan üfüqi birləşdirici taxta» (Q.), ***paçabənd*** «quşların ayağına geydirmək üçün dəri ayaqcıq» (Ln., Ş.).

2.Komponentlərdən biri alınma sözdən ibarət mürəkkəb isimlər: ***qılıcdüm*** «əqrəb» (B.), ***yağlıpiyaz*** «soğan qovurması» (Q.), ***səbzikükü*** «döyülmüş ət, yumurta və göyərtidən hazırlanan yemək» (B., Ln.), ***tiləkeşniş // tıləkeşniş*** «yabanı bitki adı» (A., Ln., M.) və s.

Belə mürəkkəb isimlər arasında komponentləri eyni mənalı Azərbaycan və İran sözündən ibarət olan leksik vahidlərə də rast gəlinir; məsələn: ***vurmabizən*** «qarışıqlıq» (B.), ***vırdıvızan*** «hay-küy» (B.), ***xəşəyonca*** «yoncaya oxşar bitki» (Ln.) və s.

### 2.2.2. Sifət

Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli alınma sözlər arasında xeyli miqdar əlamət, keyfiyyət bildirən leksik vahidlər vardır. Belə sözlər işləndiyi dialekt və şivənin ifadə rəngarəngliyinin daha da zənginləşməsinə xidmət edir. İran mənşəli alınma sifətlərin morfoloji mənimsənilməsi Azərbaycan dilinin qayda-qanunlarına əsasən baş verir.

Alınma sifətlər Azərbaycan dilində morfoloji quruluşuna görə aşağıdakı kimi qruplaşdırılır.

#### 2.2.2.1. Sadə sifətlər

Həm Azərbaycan, həm də İran dillərində bir kökdən ibarət sifətlər; məsələn: ***duraz*** «uzun» (Ab.), ***ruma//rımə*** «təzə», «körpə» (Ab.), ***sağır*** «yetim» (A., Y., Ln., Lk., C.), ***tünik//tənik*** «nazik», «həssas» (Ab., B., Y.), ***tic*** «şiş, dik» (Y., Sal.), ***xos*** «qəşəng» (A., L.,

Ln., M.), ***şətəl*** «nadinc, sözəbaxmayan» (B., Ln.), ***sital//stal*** «nadinc» (Ab., B., Q., İ., Y., M.).

İran dilləri üçün düzəltmə olan sifətlər Azərbaycan dilində sadə sifətlər kimi qəbul edilir, çünki həmin sözlərdəki sözdüzəldici şəkilçilər Azərbaycan dilində sözyaratma prosesində iştirak edə bilmir; məsələn: ***kütin*** «qozbel» (Y.), ***miyanə*** «orta, ortabab» (B., Ln., S., Sal.), ***xərəngə*** «ədəbsiz, kobud, mənasız iş tutan» (Ab., Q.), ***dastək//dəssək//dəssəy*** «qulluğa gedə bilən, 7-9 yaşlı» (A., B., Ln., M.) və s.

İran dillərində mürəkkəb sözlər komponentləri Azərbaycan dilində müstəqil işlənə bilmədiyi səbəbindən sadə hesab edilir; məsələn: ***vəgəsirə*** «yarımçıq doğulmuş» (B.), ***nimras*** «yetişməmiş» (B.), ***püşraz*** «tezyetişən» (Ab., B.), ***siyahpır//siyahpur//sıyafur*** «həyasız, utanmaz» (Ab., B., Q., ƏB., S., C., Ş.).

### 2.2.2.2. Düzəltmə sifətlər

Bu bölgüyə Azərbaycan dilində işlənən İran mənşəli şəkilçilərin və Azərbaycan dilinin öz şəkilçilərinin vasitəsilə düzələn sifətlər daxildir. Düzəltmə sifətlər aşağıdakı şəkilçilərin köməyi ilə əmələ gəlir:

***bi-, be-, na-*** ön şəkilçiləri ilə düzələnlər: ***beçiz//biçiz*** «pulsuz» (B., Ln.), ***biyəndəcər*** «çirkin, kifir» (Ab., B.), ***bedərəcə*** «xeyirsiz, boş, mənasız» (Y.), ***naxoş*** «xəstə, kefsiz» (A., Ln., Lk., M.), ***nahamar*** «hamar olmayan», ***nanəcim*** «pis, tərbiyəsiz» (B., Y.).

***-var, -vər, -avar, -əvər*** şəkilçiləri ilə düzələnlər: ***dağavar*** «dağlıq» (Ln., Y.), ***dənəvər*** «dənəli» (B., Q.), ***günəvər*** «güney, gün düşən» (Y., C.).

***-van, -avan*** şəkilçiləri ilə düzələnlər; məsələn: ***lilvan*** «lilli, bulanıq» (Ln., M.), ***malavan*** «malabaxan» (Br., Y., Ln.), ***ticavan*** «şiş, çox dik olan» (Sal.).

***-dar*** şəkilçisi ilə düzələnlər; məsələn: ***binəkdar*** «əsaslı, köklü» (B.), ***səğirdar*** «yetim uşağı olan» (A., Ln., M.), ***xaldar*** «xallı» (Sal.), ***candar*** «canlı, bədənli» (B.) və s.

***-lı, -li*** və onun fonetik variantları ilə düzələnlər: ***lığlı*** «üstü lığ ilə örtülmüş» (Q., Ln.), ***lijdi*** «saçaqlı» (Y., Ln., M.), ***morru*** «hirsli,

hikkəli» (Y.), ***tizablı*** «çox şirin» (B.), ***çəpli*** «avarlı» (B., Sal., Ln.), ***xoruşdu*** «acıqlı» (Q., Y.).

***-sız, -siz*** şəkilçiləri ilə düzələnlər: ***balbırsız*** «qanadsız» (Sal.), ***xoçasız*** «budaqsız» (Y., C.), ***girsiz*** «gücsüz» (B., Q., Ln.), ***midarəsiz*** «kimsəsiz, qohumsuz» (S.), ***xılxsız*** «sirr saxlaya bilməyən» (Y., Ln.) və s.

#### 2.2.2.3. Mürəkkəb sifətlər

Mürəkkəb sifətlər müxtəlif yolla düzəlir:

1. Mürəkkəb sifətlərin hər iki komponenti alınma sözlərdən ibarət olur; məsələn: ***kəmsər*** «axmaq, ağıldan kəm» (M., Ş.), ***bədləkər//bedləkər*** «çirkin» (B.), ***bədsülük//bədsülik*** «pis rəftar edən» (A., Ln., Y., M.), ***hampazor*** «güclü» (B., Ş.).

2. Mürəkkəb sifətlər alınma söz + Azərb. sözü modeli əsasında düzəlir; mürəkkəb isimlərdə olduğu kimi, burada da iki hal özünü göstərir:

a) eyni mənalı Azərbaycan və İran sözünün calaqlanması yolu ilə düzələnlər: ***alapisə*** «alabəzək, ala-bula» (A., Ln., Lk., M.), ***uzundraz*** (B., Q., Ln., Ş.) və s.

b) müxtəlif mənalı sözlərin birləşməsi yolu ilə düzələnlər: ***qarınxur*** «çoxyeyən» (Q.), ***güdülpaça*** «gödək, boydan balaca» (Ln.), ***qarapisə*** «qara alabəzək» (Ln.) və s.

### 2.2.3. Fel

Azərbaycan dilinin Şamaxı dialektində «donmaq» mənasında ***bıymaq*** felinin işlənməsi qeyd edilir[103]. Dialekt və şivələrimizdə işlənən fellərə xüsusi monoqrafiya həsr etmiş R.Rüstəmov də ***bıy-*** felindən bəhs etmişdir [104]. Qeyd edilən felin etimologiyası haqqında ilk mülahizə görkəmli dil tarixçimiz prof. M.Rəhimova məxsusdur. Mancur dilində ***beye-*** «donmaq» feli ilə eyni fonetik şəklə malik olduğunu əsas götürən prof. M.Rəhimov ***bıy-*** sözünü Azərbaycan

---

[103] Azərbaycan dilinin dialektoloji lüğəti. Bakı, 1964, s.82
[104] Rüstəmov R. Azərbaycan dili dialekt və şivələrində fel. Bakı, 1965, s.26

dilində mühafizə olunmuş praaltay elementi hesab edir[105]. L.Liqeti mancur ***beye-*** felinin etimoloji cəhətdən monqol ***begere-*** «donmaq, keyimək, keyləşmək» felinə uyğun gəldiyini qeyd edir. Bu fikrə münasibətini bildirən M.Rəhimov qeyd edir ki, ***bıy-*** felinin Azərbaycan dilinə monqol dilindən keçməsi fərziyyəsi inandırıcı deyil, çünki monqol dilində həmin forma yoxdur; həmin fel qədim türk dilində ***ton-***, qədim monqol dilində ***köbši-*** şəklində özünü göstərir. Daha sonra prof. M.Rəhimov yazır: «Hətta L.Liqetinin bu fikri ilə razılaşsaq belə, yuxarıda qeyd edilən mülahizə (***bıy-*** felinin praaltay elementi olması haqqında mülahizə. – T.İ.) öz qüvvəsində qalır: axı inanmaq olmur ki, monqol **begere-** fonetik dəyişikliyə uğrayaraq Azərbaycan dilinin *məhz Şamaxı dialektində* (seçdirmə mənimdir. – *T.İ.*) ***bıy-*** formasına düşmüşdür»[106] (23). Biz də prof. M.Rəhimovun bu fikri ilə razılaşırıq: niyə məhz Şamaxı dialektində həmin felin işlənməsinə təsadüf edilmişdir? Bununla yanaşı belə bir faktın qeyd edilməsi də yerinə düşər. Prof. M.Rəhimov Şamaxı dialektində ***bıy-*** felini praaltay elementi hesab edərkən, görünür, bir faktı lazımi şəkildə qiymətləndirməmişdir. Axı, Şamaxı dialektinin daşıyıcılarının gündəlik kontaktda olduğu tat dilində «donmaq» mənasında ***bəyi-***, «buz, şaxta» mənasında ***bəyə*** sözləri işlənir[107]. Digər İran dillərində də həmin sözə rast gəlmək olur [108]. Belə olan halda tat dili materialları da nəzərə alınmalıdır. Bütün bunlara baxmayaraq, Şamaxı dialektindəki ***bıy-*** «donmaq» felinin alınma olması məsələsinin dəqiqləşdirilməsi əlavə tədqiqat tələb edir.

Yuxarıda qeyd edilən halı nəzərə almasaq, Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrinə İran dillərindən sadə fel alınması müşahidə olunmamışdır. Bununla belə Şərq qrupu dialekt və şivələrində İran mənşəli sözlərdən morfoloji yolla düzəltmə və mürəkkəb fellər yaranır.

---

[105] Рагимов М.Ш. «Дивану Лугат-ит-тюрк» Махмуда Кашгари и древнетюрк ские элементы в диалектах и говорах азербайджанского языка // СТ, 1972, № 1, стр.76
[106] Yenə orada, səh.76
[107] Hacıyev M.İ. Tat dilinin Qonaqkənd ləhcəsi, s.142
[108] Пирейко Л.А. Талышско-русский словарь. М., 1976, стр.35

### 2.2.3.1. Düzəltmə fellər

Dialekt və şivələrdə ***düzəltmə fellər*** müxtəlif nitq hissələrindən fel düzəldən şəkilçilər vasitəsilə yaranır. Həmin şəkilçilər aşağıdakılardır:

***-la, -lə*** şəkilçiləri və onun fonetik variantları ilə düzələn düzəltmə fellər. Bu şəkilçilərlə düzələn fellərin mənası, əsasən qoşulduğu ismin mənası ilə bağlı olur. Düzəltmə felin mənaları həmin felin əsasında duran ismin tək və ya çoxmənalılığı ilə şərtlənir; məsələn: ***biliqümələmək*** «biliqümə ilə tutmaq» (Ln.), ***kəmləmək*** «torpağı, qumu xəlbirdən keçirmək» (Ab., B.), ***micələmək*** «ovuclamaq» (Ln.), ***sərəkləmək*** «ağzına gələni danışmaq» (Ş.), ***hərələmək*** «mişarla kəsmək» (M.), ***həşələmək*** «danmaq, gizlətmək» (B., Y., Ln.), ***çapləmək*** «avar çəkmək» (Ln., Sal.), ***lığlamaq//liğləmək*** «lığ ilə örtmək» (Q., Ln.), ***bətdəmək*** «tikmək, bağlamaq» (B.), ***mazatdamaq*** «hörmətə mindirmək» (Y.) və s.

***-lan, -lən*** şəkilçiləri ilə düzələn fellər: ***səmələnmək*** «boş-boş gəzmək, işsiz gəzmək» (Y., Ş.), ***xuylanmaq*** «dəli olmaq, özündən çıxmaq» (Q., Y.) və s.

***-laş, -ləş*** və onun fonetik variantları ilə düzələnlər: ***pəndəmləşmək*** «şişmək, çox yemək nəticəsində çətin nəfəs almaq» (B.), ***pelemürtdəşmək*** «ölgünləşmək, solmaq» (Ab.), ***gərmləşmək*** «qızışmaq» (B., M.) və s.

Başqa şəkilçilərlə düzələn fellərə misallar: ***tijəmək*** «yarmaq» (Y.), ***ləsəltmək*** «boşaltmaq, boşalmaq» (A., Ln., M., Y.) və s.

### 2.2.3.2. Mürəkkəb fellər

Dialekt və şivələrdə İran mənşəli sözlərlə ***olmaq, eləmək, tutmaq*** və s. köməkçi fellərin birləşməsi ilə mürəkkəb fellər yaranır.

«***Eləmək***» köməkçi feli ilə düzələnlər: *Eləmək* köməkçi feli, əsasən isimlərə, bəzən də sifətlərə qoşulur. Belə mürəkkəb fellərin birinci tərəfini təşkil edən adlar ismin qeyri-müəyyən təsirlik

halında işlənir; məsələn: ***dəngəsəray eləmək*** «başını ağrıtmaq» (Sal.), ***dır eləmək*** «aralamaq»[109] (A., Ln., M.), ***lüpüst eləmək*** «dərisini soymaq» (Y.), ***kütah eləmək*** «qısaltmaq» (Q.), ***pesdeyi eləmək*** «ehtiyata saxlamaq» (Ab., B.), ***sərdəsi eləmək*** «başdansovdu etmək» (B.), ***vagirlik//vangirlik eləmək*** «dəm tutmaq, səsinə səs vermək» (Ln.) və s.

*«**Olmaq**»* köməkçi feli ilə düzələnlər. Dialekt və şivələrdə İran mənşəli sözlərlə köməkçi «olmaq» felinin birləşməsindən əsasən təsirsiz fellər əmələ gəlir. «Olmaq» feli həm isim, həm də sifətlərlə birləşmək mürəkkəb fel yaradır; məsələn: ***binişt olmaq*** «məskən salmaq, yurd salmaq, oturaq həyata keçmək» (Y.), ***dəngəsər olmaq*** «başı ağrımaq» (Sal.), ***gərm olmaq*** «qızışmaq» (B.), ***pelemürt//peləmird olmaq*** «ölgünləşmək, solğunlaşmaq» (Ab.), ***papi olmamaq*** «əhəmiyyət verməmək, fikir verməmək» (Ab., B., Y., Ln., M.), ***pəndəm//pəndüm olmaq*** «şişmək, çox yemək nəticəsində çətin nəfəs almaq» (B., Y.) və s.

Başqa fellərlə düzələn mürəkkəb fellərə misallar: ***küşti tutmaq*** «güləşmək, qurşaq tutmaq» (A., Ln., M.), ***bin tutmaq*** 1. «oturmaq, oturaq həyata keçmək»; 2. «kök tutmaq» (Y.), ***mas vermək*** «ələ salmaq» (S.), ***yek getmək*** «mübahisə etmək, dalaşmaq» (B.), ***cü birəxmağ*** «şaiyə buraxmaq» (B.), ***mazata salmaq//mindirmək*** «hörmətə mindirmək» (B., S., Y.) və s.

### 2.2.4. Zərf

Şərq qrupu dialekt və şivələrinə keçmiş İran mənşəli sözlər arasında zərflər də müəyyən yer tutur. Alınma sözlərdə ən çox tərz-hərəkət zərflərinə rast gəlinir. Struktur baxımından onlar sadə və mürəkkəb olaraq iki qrupa ayrılır. Əldə olan materiallara əsasən demək olar ki, Azərbaycan dilinin öz zərf düzəldən şəkilçiləri vasitəsilə alınma sözlərdən zərf əmələ gəlməsi müşahidə olunmamışdır.

---

[109] Меджидова А.Б. Ленкоранский говор азербайджанского языка. АКД, стр.21

### 2.2.4.1. Sadə zərflər

***kəm*** «az», «kirt», «tamam» (C., Ln., M., A.), ***dır*** «aralı» (A., Ln., M.), ***sərdəsi*** «başdansovdu» (Ab., B.), ***xəvəki*** «qəflətən, birdən».

### 2.2.4.2. Mürəkkəb zərflər

Dialekt və şivələrdə müşahidə edilən mürəkkəb zərflər müxtəlif yollarla düzəlir.

1) Eyni sözün təkrarı ilə; məsələn: ***qədə-qədə*** «gizli» (C.), ***rizə-rizə*** «zolaq-zolaq» (A., Ln., M.) və s.

2) Sözlərin birləşməsi ilə; məsələn: ***peydəri*** «fasiləsiz» (Ab., B.), ***peydərpey*** «dalbadal» (B.), ***səsməkün*** «səssiz» (B.), ***tələtədili*** «tələsik» (Q.).

3) ***-a, -ə, -ba, -bə*** bitişdirici ünsürlərin köməyi ilə düzələnlər: ***dübədü*** «təkbətək» (B.), ***ruberu*** «üzbəüz» (Y., C.), ***ləbələb//lebələb*** «çox dolu» (B., Ln.), ***peşdəpeşt*** «fasiləsiz» (C.), ***sərasər*** «başdan-başa» (B.) və s.

Şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli sözlər arasında bir bağlayıcı (***şayət*** «əgər» (B., Y.), iki modal söz (***gavar//gavər*** «deyəsən» (Q., Y., Ln.), ***gəsi*** «bəlkə» (B., Ln.) qeydə alınmışdır.

Dialekt və şivələrdə alınma sözlərin morfoloji mənimsənilməsi ilə bağlı yuxarıda qeyd edilmiş faktlar və kifayət qədər misallar belə bir nəticəyə gəlməyə əsas verir ki, onların Azərbaycan dilinə keçməsi sistemsiz və xaotik proses deyil, həmin dilin fonetik-morfoloji qayda-qanunlarına tabe olması, onun sisteminə daxil olaraq başqa sözlərlə bərabərhüquqlu şəkildə bütün səviyyələrdə aktiv iştirak edə bilməsi yolu ilə baş verir.

## III FƏSİL

## ALINMA SÖZLƏRİN LEKSİK-SEMANTİK XÜSUSİYYƏTLƏRİ

Hər bir alınma söz ya alınma prosesində, ya da ondan sonra müəyyən semantik dəyişikliklərə məruz qalır. Sözlərdə semantik dəyişikliklər dünyanın bütün dillərində baş verir. Bu hadisə dilin inkişaf prosesi ilə bağlıdır.

Ümumi dilçilik ədəbiyyatında sözlərdə baş verən semantik proseslərin təhlilinə aid çox sayda əsərlər yazılmışdır[110]. Hansı dildə yazılmasından asılı olmayaraq bu əsərləri nəzərdən keçirdikdə məlum olur ki, sözlər dünyanın bütün dillərində semantik dəyişikliklərə məruz qalır. Dünya dillərində baş verən semantik hadisələr ən çox məna daralması, məna genişlənməsi, mənada ümumiləşmə və ya konkretləşmə, metafora və metonimiya əsasında mənanın keçirilməsi, müsbət məna qazanılması, mənfi məna kəsb etməsi və s. kimi təsnif edilir. Bu təsnifatlar da məntiqi, psixoloji, sosioloji əsaslarla aparılmışdır. Sözlərdə baş verən semantik dəyişikliyi psixoloji cəhətdən şərtlənən məntiqi proses kimi başa düşən fransız Arsen Darmesteter (Arsène Darmesteter), sözdəki semantik dəyişmələrə aid təsnifatını məntiqi prinsiplər üzərində quran alman Henrix Paul, bir sıra qədim rus sözlərindəki dəyi şikliklərin tarixi və kulturoloji səbəblərini tədqiq edən rus F.İ.Buslayev, sözlərin semantik inkişafını dilin morfoloji xüsusiyyətləri və dildəki sözlər arasında fəaliyyət göstərən morfoloji münasibətlərlə şərtləndiyini qeyd edən A.A.Poteb- nya və s. müəlliflərin hamısı sözdə baş verən semantik proseslərin yuxarıda adları çəkilən formalarda getdiyini qeyd etmişdir.

---

[110]L.Bloomfield. Language. New York, 1933; B.Groom. A. Short History in English Words. London, 1934; R.Carnap. İntroduction to Semantics. Cambridge, 1942; Г.Пауль. Принципы истории языка. M., 1960; S.Ulmann. The Principles of Semantics. Glasgow, 1959 və s.

H.Paul semantik dəyişmələrin ən mühüm növlərindən məna daralması və məna genişlənməsini göstərərək, onların bir-birinə əks proseslər olmasını qeyd etmişdir[111].

B.Qrum da məna genişlənməsi və daralmasına böyük diqqət verərək qeyd edir ki, məna daralması mənanın genişlənməsinə əks prosesdir. «Mənanın daralması müəyyən zaman daxilində bütöv əşyalar, predmetlər sinfini ifadə edən sözün sonradan həmin sinfin ancaq bir hissəsini ifadə etməsi, adlandırılması prosesidir. Dildə eyni bir əşyanın adlandırılması üçün iki söz mövcuddursa, nə qədər ki onların funksiyaları ayrılmayıb, onlardan biri ümumi məfhumu, digəri isə onun hissəsini bildirmirsə, həmin sözlərin yanaşı fəaliyyət göstərməsi çətindir»[112].

Sözlərin semantik inkişafı məsələləri xalqın tarixi ilə qırılmaz əlaqədə öyrənilməlidir, «çünki tarixi hadisə və dəyişikliklər əyani şəkildə dilin lüğət tərkibində, daha dəqiq desək, sözün leksik mənasında əks olunur»[113]. Bu halı semantik inkişaf baxımından hər bir sözdə izləmək olar. Məsələn, L.N.Qumilyev qeyd edir ki, indi türk dillərinin əksəriyyətində işlənən ***qul*** sözü ilkin olaraq «vassal», «rəiyyət», «başqasına tabe olan» mənalarını ifadə etmişdir və bunlardan sonuncusu XIX əsrə qədər mühafizə edilmişdir. Lakin sonralar türklər müsəlman mədəniyyəti sisteminə daxil olmuşlar ki, burada qul ticarəti xarakterik idi, onda ***qul*** termini satılmış adamlara da aid edilməyə başlandı[114].

Dilin əsil sözlərinin funksionallığının nəticəsi kimi onlarda baş verən semantik dəyişikliklərlə alınma sözlərin məruz qaldığı semantik dəyişikliklərin fərqləndirilməsi vacibdir. Ancaq bu yolla alınma sözlərdəki semantik proseslərin xarakterini öyrənmək mümkündür[115].

Nəzəri ədəbiyyatdan məlumdur ki, alınma prosesində sözlərdə ən çox məna daralması, məna genişlənməsi, sözün yeni məna kəsb

---

[111] Г.Пауль. Принципы истории языка. М., 1960, стр.106
[112] B.Groom. A Short History in English Words. London, 1934, p.132
[113] Звегинцев В.А. Семасиология. М., 1957, стр.156
[114] Гумилев Л.Н. Древние тюрки. М., 1967, str.54-55
[115] Bu barədə bax: Г.Пауль. Принципы истории языка, стр.465; Ефремов Л.П. Сущность лексического заимствования и основные признаки заимствованных слов. АКД, Алма-Ата, 1957

etməsi və s. kimi semantik hadisələr baş verir. Bu semantik proseslər alınma söz üçün də xarakterikdir. Qeyd etmək lazımdır ki, alınma söz keçdiyi dildə fonetik, morfoloji, üslubi və s. cəhətdən mənimsənilir. Həmin dilin tam hüquqlu vahidi olandan sonra dilin əsl sözlərinin məruz qaldığı dəyişikliklər onda da baş verir. Bu uzun prosesdir. Alınma sözlərdəki semantik dəyişikliklər üçün xeyli müddət lazımdır, çünki «bu dəyişmələr tədricən baş verir»[116]. Dilin əsil və alınma sözləri arasında qarşılıqlı əlaqələr onların mənalarının tarixi inkişafında ciddi sistemli şəkildə baş verir. Bu əlaqələr dilin ehtiyacından doğur.

Dialekt və şivələrimizdə işlənən İran mənşəli sözlərdə baş vermiş semantik dəyişikliklər onların Azərbaycan və İran dillərindəki mənalarının müqayisə edilməsi, qarşılaşdırılması yolu ilə öyrənilə bilər. Toplanılan materiallara əsasən, dialekt və şivələrimizdə işlənən İran mənşəli sözlərin müəyyən qismi öz mənasını dəyişmir, yəni alınma sözün mənbə dildəki semantik yükü eyni ilə qalır. Bununla yanaşı, elə sözlərə rast gəlinir ki, Azərbaycan dilində onlar semantik cəhətdən dəyişmələrə uğrayır. Belə sözlərdə mənanın daralması, genişlənməsi, eləcə də yeni məna kəsb etməsi halları müşahidə edilir.

Mənbə dildəki mənasında heç bir dəyişiklik olmayan İran mənşəli sözlər əsasən təkmənalıdır. Onlar məişətdə işlənən əşyaların, yemək və içki növlərinin adlarını, meyvə və bitki adlarını, balıqçılıqla bağlı sözləri, kənd təsərrüfatının müxtəlif sahələrində istifadə olunan alət və onların hissələrinin adları, ev, digər tikililər və onların hissələrini bildirən sözləri əhatə edir**.

***Gərmək***- (B., Ln., C.). Qeyd edilən dialekt və şivələrdə «yemişin bir növü» mənasını ifadə edir. ***Gərmək*** *çox şirin olur* (C.); *Bu üç* ***gərməyü və*** *nə verim?* (Ln.).

***Gərmək*** tezyetişən yemiş növüdür. Yuxarıda qeyd edilən mənada klassik fars dilində işlənmişdir. Bu sözə Azərbaycan klassiklərinin əsərlərində rast gəlinir[117]. Azərbaycan dilində fars

---

[116] Arnold İ.V. The English Word. M.-L., 1966, p.152

** Sözlərin tematik qruplar üzrə bölgüsünə bax

[117] Ərəb və fars sözləri lüğəti. Bakı, 1966, s.300

dilindən keçmişdir. Lənkəran şivəsində həmin sözün ***qamək*** forması da işlənir: *Balama, bu **qamək** neçədi?* Bu forma talış dilindən alınma olub, fikrimizcə, ikidilliliyin nəticəsidir. Həmin zonanın türkdilli əhalisinin nitqində isə «gərmək» şəklində işlənir ki, bu da klassik ədəbi dil ənənəsinin təsiridir, fars. ***gərm*** «isti», ***-ək*** sözdüzəldici şəkilçidir.

***Kürünc*** «buğda saxlamaq üçün yer, anbar» (A., Y., Lk., Ln., M.). Bu söz yalnız Lənkəran-Astara zonasında müşahidə edilir. Talışların nitqində daha çox ***kırıj, kırınc*** formasında işlənir. Yardımlıda ***kürünc*** kimi qeydə alınmışdır. Yardımlıda türkdilli əhalinin nitqində işlənən ***kürünc,*** bizə elə gəlir ki, talış ***kırınc*** variantının türkləşdirilmiş şəklidir: *Qabaqlar bığdanı **kürüncdə** saxleydik* (Y.).

İran dillərinin əldə etdiyimiz tərcümə və izahlı lüğətlərinin heç birisində bu sözə rast gəlmədik. Bu sözə ancaq «Талышско-русский словарь»da[118] və B.V.Millerin «Талыш ские тексты» əsərində[119] rast gəlirik. «Ərəb və fars sözləri lüğəti»ndə və 4-cildlik «Azərbaycan dilinin izahlı lüğəti»ndə də bu söz yoxdur.

***Kürünc*** sözünə rast gəldiyimiz yeganə yazılı abidə «Şeyx Səfi təzkirəsi»dir: ***Kürüncdə****, yəni bir ənbar kim dügi orada zəbt edərlər, dügi az qalmış idi* [120]. Bu abidədə ***kürünc*** sözünün işlənməsi təsadüfi deyil. Məlumdur ki, Səfəvilər sülaləsinin başçısı şeyx Səfiəddin Talışda olmuş, orada müəllimi şeyx Zahidin evində xeyli müddət yaşamış və onun qızına evlənmişdir. Çox qədim zamanlardan talış zonasının iqtisadiyyatının əsasını çəltikçilik təşkil etmişdir. ***Kürünc*** də çəltikçiliklə bağlı tikililərdəndir. Fikrimizcə, «Şeyx Səfi» təzkirəsində kürünc sözünün işlənməsi şeyx Səfinin bu mahal ilə tanışlığının nəticəsidir.

***Bəli//bəhli*** «gilas» (Q.) – *Biyil **bəhli** olmadı, quraxlığ oldu* (Q.)[121]. Türk dillərinə aid tədqiqatlarda bu sözün fars mənşəli olmasını qeyd etmişlər. K.M.Musayev türk dillərinin böyük bir arealında həmin sözün işləndiyini qeyd edərək onu fars **البالو**

---

[118] Пирейко Л.А. Талышско-русский словарь, стр.124
[119] Миллер Б.В. Талышские тексты. М., 1930, стр.232, 233
[120] Садыгов А.Ш. Язык азербайджанского письменного памятника XVI века – тезкире «Шейх Сефи»: лексика. АКД, Баку, 1972, стр.23
[121] Azərbaycan dilinin dialektoloji lüğəti. Bakı, 1964, s.73

«gilas» sözü ilə əlaqələndirir[122]. Qaraçay-balkar ***balli//bali*** sözünün Azərbaycan və noqay dilləri ilə ümumi mənbəyə malik olduğu göstərilir[123].

Azərbaycan ədəbi dilində ***gilas*** və ***albalı*** sözləri işlənir. Şərq qrupu dialekt və şivələrində isə onlardan əlavə ***bəhli//bəli*** sözləri də qeydə alınmışdır.

***Bəhli*** sözünə müxtəlif fonetik variantlarda ***bəhlibiyo // bəhlibilo // bə'libiyu // bəˤlibiyo // bəˤlibilo // bəˤlibiyu*** «sarıköynək» sözünün tərkibində də rast gəlinir[124]. Bu isə tat dilində alınma sözdür.

Topladığımız materiallara əsasən, İran dillərində çoxmənalı sözün öz mənalarını dialekt və şivələrimizdə tamamilə saxlaması hallarına rast gəlmirik. İ.Bajina yazır: «Alınma prosesində çoxmənalı sözün bütün semantik yükü ilə, yəni bütün mənalarını saxlamaqla başqa dilə keçməsi çox nadir halda olur»[125]. Bu fikirlə razılaşmaq lazım gəlsə də, bizim araşdırmalarımıza görə, çoxmənalı söz mənbə dildəki mənalarının müəyyən qismini alınma prosesində saxlaya bilir.

Fars, tacik, dəri, tat, talış və bir çox başqa İran dillərində ***sər*** sözü müstəqil leksik vahid kimi çıxış edir. Müasir fars dilində ***sər*** müstəqil söz kimi aşağıdakı mənaları ifadə edir: 1) baş; 2) başçı, rəis; 3) təpə, zirvə; 4) başlanğıc, əvvəl; 5) uc, kənar, son; 6) arzu, dilək; 7) həyat, ömür; 8) qapaq[126].

Lakin müasir Azərbaycan ədəbi dilində və başqa türk dillərində ***sər*** müstəqil söz kimi işlənmir və lüğətlərdə ona ayrıca məqalə həsr olunmur. Qeyd etmək lazımdır ki, klassik ədəbiyyatda və xalq yaradıcılığı nümunələrində ***sər*** müstəqil söz kimi işlənmişdir. «Ərəb və fars sözləri lüğəti»ndə ***sər****-in* 1) baş, kəllə; 2) təpə, zirvə; 3)

---

[122] Мусаев К.М. Лексика тюркских языков в сравнительном освещении. М., 1975, стр.196

[123] Жаппуев А. Роль соседних языков в развитии земледельческих терминов карчаево-балкарского языка // СТ, 1974, стр.64

[124] Ахмедов Т.М. Лексические взаимоотношения азербайджанского и татского языков. АКД, стр.26

[125] Бажина И. К вопросу о киргизских заимствованиях в русском языке // СТ, 1972, № 5, стр.40

[126] Миллер Б.В. Персидско-русский словарь, стр.276

başçı, rəis; 4) uc, kənar; son, nəhayət; 5) ibtidai, əvvəl; 6) məc. həyat, varlıq, can mənaları göstərilir[127].

Azərbaycan dilində, onun dialekt və şivələrində ***sər -ə; -ək; -baz; -ban; -dar*** və s. şəkilçilərlə birləşərək müxtəlif mənalar kəsb edir. Bu şəkilçilərin bəziləri Azərbaycan dilinin söz yaradıcılığında müstəqil iştirak edir.

Azərbaycan dilində, onun dialekt və şivələrində tərkibində ***sər*** olan sözlərin çoxunda ***sər*** öndə işlənir. «Azərbaycan dilinin izahlı lüğəti»ndə 53 belə söz göstərilir[128]. Bu sözlərin bəziləri ədəbi dildə işlənsə də, dialekt və şivələrimizdə ya başqa fonetik cilddə çıxış edir, ya da ədəbi dildəkindən fərqli mənalar bildirir.

Şərq qrupu dialekt və şivələrində tərkibində ***sər*** işlənən bəzi sözlərə diqqət yetirək.

***Sərab*** «abqora, qora suyu» (Ln.), fars. **سر** (***sər***) və **آب** (***ab***) sözlərinin birləşməsindən əmələ gəlmişdir. Azərbaycan dilindən fərqli olaraq fars dilində ***sərab*** sözünün tərkib hissələrinin hər biri müstəqil leksik mənaya malikdir. Fars dilinə aid lüğətlərdə ***sərab*** omonim sözlər kimi I və II rum rəqəmləri ilə verilir və aşağıdakı mənaları qeyd edilir: ***sərab*** **I** 1) ilğım; 2) boş vəd; ***sərab*** **II** 1) çeşmə, suyun başlanğıcı; 2) nadir, ən yaxşı hissə[129].

Azərbaycan ədəbi dilində ***sərab*** «ilğım» mənasını bildirir. Bu sözə ***sərab olmaq, səraba dönmək*** mürəkkəb fellərinin tərkibində rast gəlinir* (*Azərbaycan dilinin izahlı lüğəti. I c. Bakı, 1987, s.58). Klassik ədəbiyyatda isə ***sərab*** sözünün 1) bulaq, çeşmə və çayın başlanğıcı; 2) ilğım; 3) xəyal, puç ümid mənalarında işləndiyi göstərilir. ***Sərab*** sözünə başqa türk dillərində də rast gəlinir. Özbək dilində ***sərab*** 1) ilğım, 2) bulaq çeşməsi; çayın yuxarı tərəfi; arxın başlanğıcı anlamında işlənir[130].

Göründüyü kimi, Lənkəran rayonu şivələrində işlənən ***sərab*** «abqora, qora suyu» sözü həm fars, həm Azərbaycan ədəbi dillərində, eləcə də başqa türk dillərində və hətta klassik ədəbiyyat nümunələrində işlənən ***sərab*** sözündən fərqli mənada işlənir. ***Sərab***

---

[127] Ərəb və fars sözləri lüğəti, s.552
[128] Azərbaycan dilinin izahlı üğəti. IV cild, Bakı, 1987, c.60-64
[129] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), II т., стр.37
[130] Гулямов Х. Узбекско-таджикские языковые связи (лексико-этимологическое исследование). Ташкент, 1983, стр.41

sözü ***sələb*** şəklində Bakı dialektində müşahidə edilir. Burada r ~ l əvəzlənməsi göz qabağındadır. ***Sələb*** «şərbət» anlamını bildirir.

***Sərəк // sərəy*** «ağılsız, gic, axmaq» (Ş.) – *Əhməd çox* ***sərəy*** *adamdır.* Fars سر və ك sözdüzəldici şəkilçisinin birləşməsindən yaranmışdır. Şamaxı dialektində və Yardımlı rayonu şivələrində «ağılsız, gic, axmaq» mənasında ***səy*** sözü də işlənir. *–Nə* ***səy*** *adamsan* (Ş.); ***Səy-səy*** *danışma* (Y.) Demək lazımdır ki, ***səy sərəy*** sözündən hecanın düşməsi nəticəsidir. Heca düşməsi Azərbaycan dilinin dialekt və şivələri üçün səciyyəvidir.

***Sərək*** sözünə fel düzəldən ***-lə*** şəkilçisi artırmaqla ***sərəkləmək*** feli də düzəlmişdir. *-İclaslarda* ***sərəkləmək*** *ayıbdı* (Ş.).

***Səkəm*** «yarıya qədər doldurulmuş» (Ş.)[131]. Fars ***sər*** və ***кəm*** sözlərinin birləşməsindən yaranmışdır. *-Bu* ***səkəm*** *çuvalları hara aparırsuz.*

***Sərdig*** «qazan qapağı» (Q.). Fars سر ***sər*** «qapaq» və ***dig*** «qazan» sözlərindəndir. Azərbaycan dilinin dialektoloji lüğətinin çapda olan yeni nəşrində bu sözün mənası «taxtadan qayrılmış qazan qapağı» kimi açıqlanır.

Şərq qrupu dialekt və şivələrində «qazan qapağı» mənasında başqa sözlərin işlənməsi də müşahidə edilir. Məsələn, Salyan rayonu şivələrində həmin mənada ***sərduvağ*** sözü işlənir. - *Qazanın* ***sərduvağı*** *yoxdu* [132]. Şərqi Abşeron şivələrində isə ***sərpuş*** sözü həmin mənanı ifadə edir[133]. Şamaxıda piyalə və ya kasa qapağı ***sərcam*** adlanır[134].

***Sərnigün*** (*olmaq*) «başı aşağı olmaq, başı batmaq» (B.). X.Qulyamov özbək-tacik dil əlaqələrindən bəhs edərkən ***sərnigün*** sözü haqqında yazır: «Bütün türk dillərindən ancaq özbək dilinin tərkibində bu sözə rast gəlinir. A.Nəvai öz əsərlərində ***sərnigün*** sözünü işlətmişdir və lüğət müəllifləri onun iki mənada işləndiyini qeyd edirlər: 1) başıaşağı, devrilmiş, çevrilmiş; 2) *məc.* rüsvay

---

131 Şirəliyev M. Azərbaycan dialektologiyasının əsasları. Bakı, 1962, s.344
132 Ramazanov K.T. Azərbaycan dilinin Salyan dialekti. Namizədlik dissertasiyası, Bakı, 1956, s.378
133 Vəliyeva G.Q. Azərbaycan dili Şərqi Abşeron şivələrinin leksikası (müqayisəli-tarixi tədqiqat). Namizədlik dissertasiyası, s.36
134 Azərbaycan dilinin dialektoloji lüğəti. 1964, s.359

edilmiş, biabır olmuş; bəxti gətirməyən»[135]. Sitatın birinci cümləsindəki fikirlə razılaşmaq çətindir. Çünki klassiklərimizin əsərlərində ***sərnigün*** sözünə rast gəlinir və onun 1) başıaşağı, başayaq; 2) devrilmiş, yıxılmış, məhv edilmiş; 3) *məc*. talesiz, bəxtidönük, bədbəxt mənaları göstərilir[136]. Hazırda Azərbaycan ədəbi dilində işlənməsə də, Bakı dialektində «*başıaşağı» (olmaq*) mənasında ***sərnigün*** *olmaq* sözünə rast gəlinir[137].

***Sərxe//sərxeyir*** «toyu idarə edən şəxs» (ƏB., Y., M., Sal.). ***Sərxeyir*** Azərbaycan dilinin dialektoloji lüğətinin çapda olan yeni nəşrində göstərilmi**şdir.** ***Sərxey//sərxe*** variantları isə müəllif tərəfindən material toplanarkən Yardımlı və Masallı rayonları şivələrində qeydə alınmışdır. İlk baxışdan elə görünür ki*,* ***sərxeyir*** sözü fars ***sər*** və ərəb ***xeyir*** sözlərinin birləşməsindən yaranıb. Bizə elə gəlir ki, həmin söz fars dilindəki **سر خیل** (sərxeyl) sözündəndir. Fars dilində bu söz tarixizm hesab olunur və «atlı dəstəsinin başçısı, rəisi» mənasını ifadə etmişdir[138]. Güman olunur ki, semantik inkişaf nəticəsində həmin söz Azərbaycan dilində «toyu, məclisi idarə edən adam» mənasını qazanmışdır. Sözün sonundakı ***r*** səsi ***r - l*** əvəzlənməsinin nəticəsidir. Yardımlı və Masallı rayonu şivələrində sözün sonundakı ***l*** səsi düşmüş və ***sərxe//sərxey*** fonetik variantında işlənir. -*Məmmədəli toylarda zor* ***sərxeyir*** *olar* (Sal.); *Bugün toyda* ***sərxe*** *kimdi?* (M.).

Şərq qrupu dialekt və şivələrində «toyu, məclisi idarə edən adam» mənasında ***sərpayi // sərpay // sərpoy // sarpay*** sözləri də işlənir. - ***Sərpayi*** *tuydə, qunağluğda qunağlara, gələnlərə qulluq eliyən adamdu (Q.).*

Azərbaycan dilinin izahlı lüğətində ***sərpayı*** sözü ilə əlaqədar yazılır: «*is*. (fars.) köhnə. Böyük məclisi, toyu və s. idarə edən adam; ayaqüstü»[139]. Göründüyü kimi, ***sərpayı*** fars mənşəli söz hesab olunur. Müasir fars dilində ***sərpayi*** omonim söz kimi verilmişdir: ***sərpayi I*** «ev ayaqqabısı»; ***sərpayi II*** 1) qulluğa göndərilən oğlan uşağı; yüngül işləri görmək üçün qulluqçu; 2)

---

[135] Гулямов Х. Göstərilən əsəri, s.48
[136] Ərəb və fars sözləri lüğəti, s.557
[137] Şirəliyev M. Bakı dialekti, s.192
[138] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика). Пт., стр.48
[139] Azərbaycan dilinin izahlı lüğəti. IV c., Bakı, 1987, s.62

yeriyən, gəzən (xəstə haqqında); 3) bir anlığa, ayaqüstü[140]. Göründüyü kimi, müasir fars dilində ***sərpayi*** «toyu, məclisi idarə edən adam» mənasında işlənmir. Fars dilinin dialekt və şivələrində də ***sərpayı*** sözünün ədəbi dildəki mənalarda işləndiyi qeyd edilir[141]. Klassik fars dilində «toyu, məclisi idarə edən adam» mənasında *sərpayə* sözünün işləndiyi və həmin vaxtdan Azərbaycan dilinə keçməsi güman olunur. Bu söz ərəb və fars sözləri lüğətində də həmin mənada qeydə alınıb[142]. Bunları nəzərə alaraq belə bir nəticəyə gəlmək olar ki, şərq qrupu dialekt və şivələrində işlənən ***sərpayi*** fars mənşəli sözdür. Müasir fars dilində əvvəlki mənasını itirən ***sərpayi*** sözü Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində həmin mənanı mühafizə etmişdir. Bununla yanaşı bir cəhəti də qeyd etməliyik. ***Sərpayi*** sözü, əsasən tatların yaşadığı ərazidə müşahidə edilir. Bakı, Quba, Şamaxı dialektlərində, Abşeron şivələrində ***sərpayi*** sözü üçün mənbə dil tat dilinin olması da istisna deyil. Adı çəkilən dialekt və şivələrdə həmin sözün müxtəlif variantlarda qeydə alınması da fikrimizi sübut edir.

Şərq qrupu dialekt və şivələrində tərkibində ***sər*** olan aşağıdakı sözlər də işlənir: ***dərosər//darasar*** «qapı və pəncərə üstünə qoyulan taxta» (A., Ln., M.), ***düsəri*** «hər iki tərəfi iti mismar» (B.), ***dəngəsaray*** *eləmək* «boğazı yığmaq, incitmək» (Sal.), ***kəmsər*** «axmaq, ağılsız» (İs., Ş.), ***dağbəsər*** «dağüstü» ***gülbəsər*** 1.»xiyar» (Ln., C.); 2. «xiyar və üzümün güldə olan vaxtı» (Ab.), ***səvard*** «çəltik tarlasının başlanğıc tərəfi» (Ln.), ***sərəqət*** «evin damı ilə divarı arasındakı boşluq» (Q.), ***sərtaxti*** «toyun yeddinci günü gəlini görməyə gələnlərin gətirdiyi xonça və ya hədiyyə» (Ab.), ***sərdəsi*** eləmək «başdansovdu» eləmək (B.), ***sərgül*** «nübar, ilk məhsul» (Ab., B.), ***təndirəsər*** «təndir qoyulan yer» (Ln., M.) və s.

Alınma sözlərdə baş verən semantik dəyişikliklərdən danışarkən mənanın daralması xüsusi qeyd edilməlidir. Yuxarıda mənanın daralması haqqında bəhs edərkən göstərildi ki, alınma prosesində sözün mənasının daralması ilə dilin özünəməxsus sözlərinin tarixi inkişaf prosesində mənasının daralması, konkretləşməsi hadisəsinin

---

[140] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), т.II.
[141] Смирнова Л.П. Исфаханский говор. Материалы к изучению. М., 1978, стр.85
[142] Ərəb və fars sözləri lüğəti, s.557

fərqli cəhətləri vardır. Başlıca fərq ondan ibarətdir ki, xalq sözü başqa dildən alarkən onu özünə lazım olan, ehtiyac hiss etdiyi mənada işlədir. «Alınma sözün mənası ya qismən, ya da tam şəkildə özünün ilkin mənasından fərqlənir, yəni bu və ya digər sözü alarkən xalq onun fonetik, morfoloji və semantik strukturuna öz «düzəlişlərini» edir»[143] Alınma sözün mənasının daralması dedikdə, ilk növbədə sözün mənbə dildəki mənalarının kəmiyyətcə azalması başa düşülməlidir. Mənbə dildə çoxmənalı söz dialekt və ya şivənin lüğət tərkibinə keçdikdə onun mənalarından biri saxlanır, digər mənaları isə atılır, çünki həmin mənaları ifadə etmək üçün dialektin öz imkanları vardır. Şərq qrupu dialekt və şivələrində İran dillərində çoxmənalı sözlərin mənasının kəmiyyətcə daralması geniş yayılmış hadisələrdəndir. Misallara diqqət yetirək.

***Beçəxor*** – fars **بچه خور** (bəč(č)exor) sözündəndir. Söz ortasında ***ə*** > ***e*** əvəzlənməsi baş vermiş, qoşa samitlərdən birinin düşməsinə səbəb olmuşdur. Fars dilində 1) balasını yeyən heyvan; 2) *tibb*. Ana bətnində əmələ gələn şiş, ur mənaları göstərilir[144]. Lənkəran şivəsində ikinci mənada işləndiyi qeydə alınmışdır[145].

***Gav*** – fars **گاو** (gāv) sözündəndir. Fars dilində 1) inək, öküz; 2) *astr*. Yeddi qardaş, Ülkər; 3) zodiakın bürclərindən birinin adı [146]. Fars dilindəki mənalarından ancaq biri, konkret olaraq «öküz» mənasında Sabirabad rayonu şivələrində qeydə alınmışdır[147]. Həmin mənada yazılı abidələrdə və klassik ədəbiyyat nümunələrində rast gəlinir[148].

***Gərdənəməd*** «xamut, boyunluq» (Sal.). Bu söz fars **گردن بند** (gərdənbənd) sözünün Salyan rayonu şivələrində fonetik şəkildəyişməsidir. ***b*** > ***m*** əvəzlənməsi və ***d*** səsindən əvvəl sonorun düşməsi göz qabağındadır. Fars dilində 1) boyunbağı; 2) xamut,

---

[143] Асланов В.И. Иноязычные элементы в казахском диалекте азербайджанского языка. ВДТЯ, т.IV, Баку, 1966, стр.130.

[144] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), т.I, стр.182
[145] Azərbaycan dilinin dialektoloji lüğəti. Bakı, 1964, s.65
[146] Миллер Б.В. Персидско-русский словарь, стр.416
[147] Azərbaycan dilinin Muğan qrupu şivələri. Bakı, 1955, s.184
[148] Qəhrəmanov C. «Əsrarnamə». Bakı, 1964, s.94

boyunluq mənaları göstərilir[149]. Salyan rayonu şivələrində ancaq ikinci mənada işləndiyi müşahidə edilmişdir. - ***Gərdənəmədin*** *ipin bərk bağlaginən ki, at yaxşı güc eləsin.*

***Kələsər // giləsər*** «eşşək arısı» (Q.). Tat dilində 1) yekəbaşlı; 2) eşşək arısı mənalarında işlənən bu söz Quba dialektində ancaq 2-ci mənada işlənir[150].

***Zərəndaz*** «zərli baş örtüyü» (Ln.). Əslində ***sərəndaz*** fars ***sər*** «baş» və ***əndaz*** انداختن (əndaxtən) «atmaq» felinin kökü) sözlərinin birləşməsindən yaranıb. Lənkəran şivəsində ***s*** > ***z*** samit əvəzlənməsi baş vermiş, «zərli» semantikası həmin samit əvəzlənməsi ilə meydana çıxmışdır.

***Pərəndə*** «qanadlı, quşlar sinfinə aid olan» (Ln., M.) fars پرنده (pərənde sözündəndir). Söz sonunda ***e*** > ***ə*** əvəzlənməsi baş vermişdir. Fars dilində 1) quş; 2) uçan, qanadlı; 3) uçucu, tez buxarlanan mənaları göstərilir[151]. Lənkəran və Masallı rayonu şivələrində «qanadlı quşlar sinfinə aid olan» mənasında qeydə alınmışdır. -*Hər **pərəndənin** əti yeyilmir* (M.).

***Püşraz*** «tez yetişən, tez dəyən» (B.) fars پیشرس (pişrəs) sözündəndir. Aşağıdakı mənalarda fars dilində işlənir: 1) tez yetkinləşən; 2) tez yetişən; 3) erkən[152]. Bakı dialektində «tez yetişən, tez dəyən» mənalarında işlənir: ***püşraz*** qarpız[153]. Dialektdə ***i*** > ***ü*** və ***s*** > ***z*** əvəzlənmələri baş vermişdir.

Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində İran mənşəli sözlərin mənalarında keyfiyyətcə daralma hadisəsi müşahidə edilir. Mənanın keyfiyyətcə daralması dedikdə mənbə dildə daha geniş və ümumi məfhumu ifadə edən sözün dialekt və ya şivə leksikasında konkret anlayış və hadisəni ifadə etməsi nəzərdə tutulur. Alınma sözün mənasında keyfiyyətcə daralma hadisəsi müəyyən mənada həmin sözün Azərbaycan dilinə çoxdan keçdiyini

---

[149] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), т.II, стр.390
[150] Ахмедов Т.М. Лексические взаимоотношения азербайджанского и татского языков. АКД, стр.30
[151] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), т.I, стр.114
[152] Yenə orada, s.152
[153] Şirəliyev M.Ş. Bakı dialekti, s.209

göstərir. Məlumdur ki, alınma sözün mənasının konkretləşməsi və ya xüsusiləşməsi hadisəsi dilin əsil sözləri ilə alınma sözlərin qarşılıqlı əlaqə və münasibətlərinin nəticəsi kimi ortaya çıxır. Bu fikri misalla izah edək.

Azərbaycan dilinin Yardımlı rayonunda material topladığımız vaxt Hamarkənd şivəsində ***tən*** sözünü qeydə aldıq. ***Tən*** «insan və heyvan bədəninin bir üzvü» mənasını ifadə edir. Həmin sözün Azərbaycan dilinin yazılı abidələrində, klassik ədəbiyyat nümunələrində «bədən» mənasında işləndiyi məlumdur və «Ərəb və fars sözləri lüğəti»ndə qeydə alınmışdır[154]. «Kitabi-Dədə Qorqud» dastanlarında eyni mənada işlənir[155]. «Qutadqu bilik», «Kodeks Kumanikus»[156] kimi ümumtürk abidələrində də işlənmişdir. Bu sözə Kaşqari «Luğət»ində[157], «Qədim türk dilləri lüğəti»ndə[158], Radlov[159] və L.Budağovun[160] lüğətlərində də həmin mənada rast gəlirik. Ümumiran mənşəli sözdür. Orta fars dilində ***tan*** sözünün «bədən», «şəxs» mənaları göstərilir [161]. Azərbaycan dilinə klassik fars dilindən keçməsi ehtimal olunur. Uzun müddət klassik ədəbiyyat nümunələrində, yazılı abidələrdə «bədən» mənasını ifadə etmiş ***tən*** sözü müasir ədəbi dildə arxaikləşmişdir və ancaq bəzi dialekt və şivələrdə qalmışdır. Lakin dialekt leksikasında ***tən*** sözünün mənasında daralma baş vermişdir.

Osetin dilində də ***tæn // tænæ*** sözü «qarnın aşağı hissəsi» mənasında işlənir və **V.** Abayev onu İran ****tanu*** «bədən» sözü ilə bağlayır[162].

***Vəcə*** Quba dialektində [163] və İsmayıllı rayonu şivələrində[164] işlənir. Tat dilindən keçməsi ehtimal olunur. Məlumdur ki, qədim

---

[154] Ərəb və fars sözləri lüğəti, s.615
[155] Пириев Э.Р. Персидские слова в языке «Книги моего деда Коркуда». Дисс., Баку, 1989, стр.135
[156] Bodrog Ligeti A. The Persian Vocabulary of the Codex Cumanicus. Budapest, 1971, p.189
[157] Divanü lügat- it-türk düzümü. Ankara, «Endeks», 1943, s.598
[158] Древнетюркский словарь. Л., 1969, стр.531, 544
[159] Радлов В.В. Опыт Словаря тюркских наречий. Т.III, ч.2, Спб., 1905, стр.1051
[160] Будагов Л.З. Сравнительный словарь турецко-татарских наречий. Т.I, Спб., 1869, стр.378
[161] Mackenzie D.N. A Concise Pahlavi Dictionary. London, 1971, p.81
[162] Абаев В.И. Историко-этимологический словарь осетинского языка. Т.III, Л., 1979, стр.261

İran dillərində sözönü ***v*** səsini saxlayan dillərdən biri də tat dilidir. Qədim İran dillərində sözönü ***v*** tarixi inkişaf prosesində fars, tacik və s. dillərində ***b*** səsinə keçmişdir[165]. Sözönü ***v*** talış dilində də qalmışdır [166]. Əyanilik xatirinə bir misala diqqət yetirək.




Haqqında danışdığımız ***vəcə*** sözü orta fars dilində ***vaččag*** şəklində işlənmişdir[167]. ***Vəcə*** sözünün müasir fars dilində qarşılığı ***bäčče***-dir. Qanunauyğun olaraq orta fars dilindəki ***v*** müasir fars dilində ***b***-yə keçmişdir. Azərbaycan dilində ***beçə*** sözü də işlənir. Güman etmək olardı ki, Quba və İsmayıllı rayonu şivələrindəki ***vəcə*** elə ədəbi dildəki ***beçə*** sözüdür ki, onda ***b***>***v*** əvəzlənməsi baş vermişdir. Lakin ***b***>***v*** əvəzlənməsi Quba dialekti üçün və ümumiyyətlə şərq qrupu dialekt və şivələri üçün xarakterik deyil.

Bu hadisə əsasən qərb və qismən şimal qrupu dialekt və şivələrinə aiddir[168]. Doğrudan da Şəkidə və Göyçayda «yeni əmələ gəlmiş arı ailəsi» mənasında ***veçe*** sözü işlənir [169].

Tat dilində ***vəcə*** «bala, körpə» deməkdir[170]. Quba dialektində həmin söz daha konkretləşərək «körpə adı» anlamında işlənir.

---

163 Rüstəmov R.Ə. Quba dialekti, s.233
164 Hacıyev İ. İsmayıllı rayonu şivələri. Namizədlik dissertasiyası, Bakı, 1948
165 Расторгуева В.С. Сравнительно-историческая грамматика западно-иранских языков (Фонология). М., 1990, str.89
166 Миллер Б.В. Талышский язык, стр.228
167 Mackenzie D.N. A Concize Pahlavi Dictionary. London, 1971, p.85
168 Şirəliyev M. Azərbaycan dialektologiyasının əsasları, s.86
169 İslamov M. Azərbaycan dilinin Nuxa dialekti. Bakı, 1968, s.195; Vəliyev A. Azərbaycan dialektologiyasına aid materiallar; Göyçay keçid şivələrinin leksikası. Bakı, 1960, s.27
170 Hacıyev M. Tat dilinin Qonaqkənd ləhcəsi, s.103

İsmayıllı rayonu şivələrində isə ***vəcə*** «keçi balası»na deyilir. -*Bugün* ***vəcələr*** *yaxşı otdadı.*

Mənbə dildə təkmənalı sözün mənasının daralması hadisəsi dialekt və şivələrimizdə müşahidə edilir. Təkmənalı sözün mənasının daralması o zaman baş verir ki, həmin sözün ifadə etdiyi növ əlaqələrinin dəyişməsi müşahidə edilir: mənbə dildə növ məfhumunu bildirən söz keçdiyi dialektin və ya şivənin leksikasında artıq həmin məfhumu ifadə edə bilmir, çünki dildə ümumi məfhumu bildirən söz vardır. Bu səbəbdən alınma sözün mənası daralaraq həmin növ məfhumunun bir hissəsini ifadə etməyə başlayır. Məsələn, ümumiran mənşəli ***кard*** sözü fars dilində «bıçaq» məfhumunu bildirir[171]. Bu sözə şərq qrupu dialekt və şivələrinin bir çoxunda rast gəlinir, lakin fars dilindəki məna həcmi daralmış, müxətlif fonetik variantlarda çıxış edərək bıçağın bir növünü bildirir: ***kort*** «iri bıçaq» (M., C.), ***gərde//gorda*** «bıçaq növü» (Ab., B.), ***giləğurt*** «iri qatlanmayan bıçaq» (Br.).

İsmayıllı rayonu şivələrində ***ard*** sözü «unun tozu» mənasında qeydə alınmışdır. -*Dəyirmanın* ***ardınnan*** *mınnan yaxşı çörək olmaz*[172].

Həmin mənada ***ard*** sözü Cəbrayıl rayonu şivələrində də işlənir [173]. Udin dilində isə ***ard*** «dəyirman daşının ətrafına yığılan un» mənasını bildirir və həmin sözün udin dilinə Azərbaycan dilinin dialekt və şivələrindən keçməsi göstərilir [174].

***Ard*** «un» mənasında İran dillərinə aid sözdür. Azərbaycan dilində onun qarşılığı ***un*** sözüdür. Dialekt və şivələrimizdə ***ard*** «dəyirman daşının arxasına yığılan un»a deyilir. ***Ard*** Azəraycan dilində «arxa, geri» deməkdir və həmin mənada o, Mahmud Kaşğaridə işlənmişdir [175]. Bunları nəzərə alaraq V.Qukasyan qeyd edir ki, türk ***ard*** «arxa» və İran ***ard*** «un» sözlərinin ancaq fonetik

---

[171] Миллер Б.В. Персидско-русский словарь, стр.391
[172] Hacıyev İ. İsmayıllı rayonu şivələri. Namizədlik dissertasiyası, s.235
[173] Hacıyev T. Azərbaycan dilinin Cəbrayıl şivəsi. Namizədlik dissertasiyası, Bakı, 1962, s.326
[174] Гукасян В.Л. Взаимоотношения азербайджанского и удинского языков. Докторская диссертация, Баку, 1973, стр.83
[175] Mahmud Kašgari. Divanü lügat-it-türk tercümesi, çeviren Besim Atalay, I, Ankara, 1939, s.42

cəhətdən uyğunluğu vardır. Və belə bir nəticəyə gəlir ki, udin (eyni zamanda Azərbaycan dialektal) ***ard*** «dəyirman daşının arxasına yığılan un» semantik cəhətdən türk ***ard*** «arxa» sözü ilə birləşir[176]. Bu fikirlə razılaşmaq olmaz. Bizə elə gəlir ki, dialekt və şivələrimizdə işlənən ***ard*** «dəyirman daşının arxasına yığılan un» və ***ard*** «arxa» sözləri deyilişi və yazılışı eyni olub müxtəlif mənalara, müxtəlif etimoloji mənşəyə malikdir.

Bəlkə də bu sözlərin eyni qəbul edilməsinin müəyyən psixoloji əsasları vardır Əslində, fikrimizcə, dialekt və şivələrimizdə İran mənşəli ***ard*** sözünün mənasında daralma hadisəsi baş vermişdir. Dialekt və şivələrimizdə ***un*** sözü işləndiyindən İran ***ard*** sözü artıq həmin məfhumu bütövlükdə ifadə edə bilməmiş və onun mənası konkretləşmişdir.

***Gərde // gərdə*** «saman xırdası» (Ab., Q.) fars mənşəli **گرد** (gərd) «toz» sözündəndir. Dialekt və şivələrimizdə məna həcmi daralmış və «saman xırdası» anlamında çıxış edir. *-Usda* ***gərdəni*** *palçuğa qarışdırıbanı öyü suvıyadu* (Q). Bu sözə başqa türk dillərində də rast gəlmək olur. Türkmən ədəbi dilində həmin mənada ***qert*** fonetik variantında işlənir[177]. Özbək dilinin dialektlərində isə «narın un» mənasında müşahidə edilir.

Şərq qrupu dialekt və şivələrində İran mənşəli alınma sözlər öz etimonuna nisbətən geniş mənada işləndiyi hallar da müşahidə edilir. Belə bir hal təbiidir, «çünki mənbə dildən uzaqlaşan və yeni dil mühitində qismən semantik sərbəstlik qazanan sözlər dəyişilməz qalmır, əksinə, yeni-yeni işlənmə sahələri kəsb edərək öz mənalarını genişləndirir…»[178].

Dialekt və şivələrimizin leksikasında alınma sözün mənasının həm kəmiyyət, həm də keyfiəyyətcə genişlənməsi baş verir. İran dillərindən alınma söz dialekt və şivələrimizdə əlavə mənalar kəsb edir, yəni sözün mənaları kəmiyyətcə artır.

---

[176] Гукасян В.Л. Взаимоотношения азербайджанского и удинского языков. Докторская диссертация, Баку, 1973, стр.84

[177] TRS, 1968, s.175

[178] Həsənov B.S. Alman dilində işlənən türk sözlərinin leksik-semantik xüsusiyyətləri // M.F.Axundov adına APDİ-nin Elmi Əsərləri, XII seriya, 1973, № 3, s.15

Şərqi Abşeron şivələrində tat dilindən alınma ***rıma// rimə //ruma*** sözü işlənir[179]. Tat dilində ***ruma*** «təzə, körpə (tərəvəz haqqında)» mənasını bildirir. Qeyd olunan şivələrdə həmin söz tat dilindəki mənasından (məs. *Nə **rıma** turpdır bu, yiməgdən toymaq olmır*) əlavə «yumşaq» anlamında işləndiyi müşahidə olunur. - *Uşağın sümigi* ***rumadu*******.

Həmin şivələrdə ***şebpərə//şəppələ*** sözünə rast gəlinir. Fars mənşəli ***şəbpərə şəb*** «gecə» və ***pərə*** پريدن (pəridən) ***uçmaq*** felindən) sözlərindən yaranmışdır və «gecə quşu» deməkdir. Şərqi Abşeron şivələrində ***şebpərə//şəppələ*** «gecə quşu» mənasından əlavə «yuxusu olmayan, narahat adam» anlamını da kəsb etmişdir[180].

***Tünik//tənik***. M.Şirəliyev «Bakı dialekti»ndə bu sözü ***tünik // tünik*** fonetik variantlarında qeydə alınmış və «nazik» mənasını göstərmişdir [181].

G.Vəliyeva ***tünik*** sözünün «nazik» mənasından əlavə «həssas adam» anlamında işləndiyini qeyd edir[182]. Lənkəran, Masallı və Yardımlı şivələrində ***tənik*** «nazik» fonetik variantı işlənir. Azərbaycan dilinin dialektoloji lüğətinin çapda olan yeni nəşrində isə yuxarıdakı variantlardan əlavə Xudatda və Sisyanda ***tünək // tünəki*** kimi qeydə alınmış və «nazik» mənasından əlavə «zəif, arıq heyvan» anlamı da göstərilmişdir.

Qeyd etmək lazımdır ki, dialekt və şivələrimizdə bu sözün müxtəlif fonetik variantları onun üçün mənbə dilin eyni olmadığına əyani sübutdur. Görünür, həmin sözün dialekt və şivələrimizə keçməsi mümkün olan mənbə dillərdən yalnız «nazik» mənası alınmışdır. Onun dialektlərimizdə rast gəlinən digər məna çalarları isə Azərbaycan dili mühitində qazanılmışdır və bilavasitə «nazik» mənası ilə bağlıdır.

---

[179] Велиева Г.Г. Лексика восточноапшеронских говоров азербайджанского языка (сравнительно-историческое исследование). АКД, стр.8

***Misal Azərbaycan dili dialektoloji lüğətinin çapda olan yeni nəşrindən götürülüb

[180] Vəliyeva G.Q. Azərbaycan dilinin Şərqi Abşeron şivələrinin leksikası (müqayisəli-tarixi tədqiqat). Namizədlik dissertasiyası, Bakı, 1984, s.51

[181] Şirəliyev M. Bakı dialekti. Bakı, 1957, s.195

[182] Vəliyeva G.Q. Azərbaycan dilinin Şərqi Abşeron şivələrinin leksikası. Namizədlik dissertasiyası, s.41

***Tünik*** sözü ilə əlaqədar bir məsələni qeyd etməyə bilmərik. Prof. V.Aslanov «morfoloji quruluşuna görə qədim türk sözlərinə oxşadığına görə» ***tünük*** sözünün İran mənşəli olmadığını qeyd edir[183]. Bununla əlaqədar həmin sözün tarixi-etimoloji inkişaf yoluna nəzər salaq. Qeyd etmək lazımdır ki, bu söz İran dillərinin və eləcə də Hind-Avropa dillərinin çox geniş bir arealında yayılmışdır.

İranşünaslar həmin sözü etimoloji cəhətdən İran **tanu-*** Hind-Avropa ****tenu-*** «nazik» sözü ilə bağlayırlar[184].

Qədim və orta İran dillərində aşağıdakı mənzərəni müşahidə edirik: av. ***tanu-ka*** «nazik», qədim fars ****tanu-*** «nazik», orta fars ***tanuk*** «nazik, zərif», kl. fars ***tanuk // tunuk*** «nazik, seyrək, dayaz»[185]. Qədim hind dilində ***tanú-*** «nazik, zərif» mənalarından əlavə «arıq» anlamını da bildirmişdir[186].

Müasir İran dillərinin əksəriyyətində eyni semantik çalarlar müşahidə olunur: fars ***tonok*** «nazik, zərif, seyrək, dayaz»[187], tac. ***tunuk*** «nazik, zərif»[188], kürd ***tänək*** «nazik, dayaz» (çay haqqında); seyrək (meşə haqqında)[189], kürd ***маньк*** «nazik»[190], tat. ***tünük*** «nazik» [191], talış. ***toнык//təнык*** «nazik, seyrək» (talış dilində «dayaz» mənasında ***təнысk*** sözü işlənir)[192], osetin. ***tænæg*** «nazik, seyrək, dayaz» (su haqqında)[193] və s.

***Nazik*** – ***seyrək*** məna çalarları Hind-Avropa dillərində də geniş yayılmışdır və ən çox german qrupu dillərində rast gəlinir:

[183] Aslanov V.İ. XII əsrə qədərki Azərbaycan dili haqqında // AFM, I buraxılış, 1983, s.80
[184] Абаев В.И. Историко-этимологический словарь осетинского языка. T.III, Л., 1979, стр.263
[185] Расторгуева В.С. Сравнительно-историческая грамматика западноиранских языков (фонология). М., 1990, стр.88
[186] Расторгуева В.С. Сравнительно-историческая грамматика западноиранских языков (фонология). М., 1990, стр.88
[187] Миллер Б.В. Персидско-русский словарь, стр.135
[188] Таджикско-русский словарь. М., стр.411
[189] Курдоев К.К.Курдско-русский словарь. М., 1960, стр.740
[190] Бакаев Ч.Х. Язык азербайджанских курдов. М., 1965, стр.252
[191] Hacıyev M. Tat dilinin Qonaqkənd ləhcəsi, s.151
[192] Пирейко Л.А. Талышско-русский словарь, стр.211
[193] Абаев В.И.Историко-этимологический словарь осетинского языка. T.III, Л., 1979, стр.263

anqlosak. ***thunni*** «nazik, seyrək», ing. ***thin*** «nazik, seyrək, açıq, duru»[194]. Və nəhayət slavyan dillərinin faktlarına nəzər salaq: qədim slavyan. ***tьnьk***, serb-xorvat. ***tänak***, rus. ***тонкий*** «nazik» və s.

Göründüyü kimi, İran və eləcə də Hind-Avropa dillərinin çox böyük bir arealında işlənən bu sözün Hind-Avropa mənşəli olmasına şübhə ola bilməz və dialektlərimizin leksikasına İran dillərindən keçməsi şübhəsizdir.

Dialekt və şivələrimizdə mənanın keyfiyyətcə genişlənməsinin şahidi oluruq, yəni Azəbaycan dili mühitində alınma söz mənbə dildə ifadə etdiyi mənasının həcm dairəsini genişləndirir. Fikrimizi misallarla izah edək. Talış dilində «tumurcuq, zoğ» mənasını ***çipə//çüpə*** sözü bildirir. Yardımlı rayonu şivələrində həmin söz «kol» mənasında qeydə alınmışdır. -*O yerdə çoxlu* ***çüpə*** *var, qır, qoy göy ot gəlsün; Qoyin* ***çüpəlikdə*** *otdey;* ***Çüpəlikə*** *girə bilmərəm, üstüm cırıley*[195].

Şərq qrupu dialekt və şivələrinin çoxunda «piyalə, kiçik kasa, kiçik qab» mənasında ***masqu r// masqura*** sözü işlənir. Bu söz fars **ماست** (mast) və **خور** (xor) «yemək» felinin kökü) sözlərindən yaranmışdır. Hərfi tərcüməsi «qatıq yeyilən qab» deməkdir[196]. Amma dialektlərimizdə bu sözün mənası genişlənmişdir. Bunun nəticəsində ***masqur // masqura*** dedikdə təkcə «qatıq yeyilən qab» deyil, ümumiyyətlə, məişətdə istifadə olunan kiçik kasa nəzərdə tutulur. -*Bir* ***masqura*** *yağ daşıb pamal oldu (M.); Anam qaymaqları* ***masxuralara*** *tökdü (Sal.).*

Məna genişlənməsi ***dəmərdə // dəhmərdə*** «dərin boşqab» (Ə., ƏB., Ln., S.) sözündə də müşahidə edilir. «Ərəb və fars sözləri lüğəti»ndə onun «ikiadamlıq qab» mənası göstərilir[197]. Görünür, sonralar ***dəhmərdə*** «dərin boşqab», «dərin qab» mənasını kəsb etmişdir.

Dialekt və şivələrimizdə işlənən İran mənşəli alınma sözlərdə bəzən yeni məna kəsb etməsi halı da müşahidə edilmişdir.

---

[194] Müller V.K. English-Russian Dictionary. Moscow, 1982, p.762

[195] Həmzayev T.B. Yardımlı rayonu şivələrinin lüğətinə dair bəzi qeydlər // Azərb.SSR EA Xəbərləri, ədəbiyyat dil və incəsənət seriyası, 1969, № 2, s.102

[196] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), т.II, стр.440

[197] Ərəb və fars sözləri lüğəti, s.159

***Fəriştə//fərişdə*** (Q.) ***firiştə*** (Ln., M.) «körpə, qırxı çıxmayan uşaq» - Ümumiran mənşəli sözdür. Avestada ***fraēšta*** «elçi, xəbər gətirən, mələk» mənasını ifadə etmişdir[198]. Fonetik cəhətdən müəyyən dəyişikliyə uğrayan həmin sözə orta fars dilində ***frēstag*** (erkən orta fars ***freštak***)[199], klassik fars dilində ***firišta//fırešta*** formasında rast gəlinir[200]. Müasir İran dillərinin faktlarına nəzər salaq: m.f. **پرِشته** ***(fereŝte)*** «mələk» (eyni zamanda xüsusi isim kimi ***Fereŝte***)[201], tac. ***farišta*** «mələk», puştu ***firixtə*** «mələk», tat. ***farišta*** «mələk», tal. ***firištä*** «mələk», «körpə uşaq» və s.

***Fərişta//firiştə*** sözü klassik ədəbiyyatda, yazılı abidələrdə «mələk» mənasını ifadə etmişdir[202].

Radlov türk dillərində həmin sözün ***näpiшmä// фäpiшmä*** fonetik variantlarında işləndiyini göstərir[203]. «Qədim türk sözləri lüğəti»ndə «mələk» mənasında ***färišta//firištä*** sözünə ayrıca məqalə həsr olunmuş və onun fars mənşəli olması qeyd edilmişdir[204]. S.Malov[205] və A.Borovkov[206] da bu sözü fars mənşəli hesab edirlər.

Məsələ bundadır ki, şərq qrupu dialekt və şivələrində ***fərişta//firiştə*** sözləri klassik ədəbiyyatda, yazılı abidələrdə rast gəlinən mənada işlənmir. Həmin söz dialekt və şivələrdə yeni – «körpə uşaq» mənası kəsb etmişdir.

Mələk – körpə uşaq semantikası heç də təəccüblü deyildir. Dini təsəvvürə görə, mələklər günahı, səhvi olmayan məxluqdur və hər bir insanın çiynində iki mələk onun elədiyi yaxşılıq və pislikləri qeydə alır. Bu da aydındir ki, körpə də dünyaya heç bir günahı, təqsiri olmadan gəlir. Mələk – körpə uşaq mənaları arasında əlaqə, bağlılıq özünü belə göstərir. Bundan əlavə, həmin mənanın inkişafı

---

[198] Оранский И.М. Иранские языки в историческом освещении, стр.67
[199] Mackenzie D.N. A Concise Pahlavi Dictionary. London, 1971, p.34
[200] Расторгуева В.С. Сравнительно-историческая грамматика западно- иранских языков (фонология). М., 1990, стр.150
[201] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), т.II, стр.410
[202] Məsələn: Qəhrəmanov C. Əsrarnamə. Bakı, 1964, s.89; Qəhrəmanov C., Hacıyeva Z.T. Yusif Məddah. «Vərqa və Gülşah». Bakı, 1988, s.32; Султанов Б.Х. Арабско-персидские заимствования в «Кутадгу билик» Ю.Баласагуни // СТ, 1981, № 4, с.18
[203] Радлов В.В. Опыт словаря тюркских наречий. Т.IV, Спб., 1911, стр.1232, 1922
[204] Древнетюркский словарь. Л., 1969, стр.193, 194
[205] Малов С.Е. Памятники древнетюркской письменности. М.-Л., 1951, стр.378
[206] Боровков А.К. Лексика среднеазиатского тефсира XII-XIII вв. М., 1963, стр.344

üçün, yəni mələk → körpə uşaq semantikası üçün «məsum, günahsız» məna çaları da bağlayıcı həlqə ola bilər. ***Fərıştə*** sözünün belə məna çaları da lüğətlərdə göstərilir[207].

Müasir Azərbaycan dilində ***dost*** fars dilindən alınma sözdür. Ədəbi dildə «dost, yoldaş» məfhumunu ifadə edən bu söz Azərbaycan dilinin dialekt və şivələrində yeni məna kəsb etmişdir. Bakı dialektində və Lənkəran şivəsində ***əmidosdi, dayıdosdi*** sözlərinin tərkibində və eləcə də ayrılıqda ***(dosdi)*** işlənərək «əmi arvadı» və ya «dayı arvadı» mənasını bildirir. -***Dosti*** *bugün bizə gəlmişdir* (B.).

Azərbaycan dilinin dialektoloji lüğətinin çapda olan yeni nəşrində Quba və Zərdab rayonu şivələrində «donuz balası» mənasında ***sıpa*** sözünün işləndiyi göstərilir. Bu sözün İran mənşəli olması şübhəsizdir. İranşünaslar qeyd edirlər ki, Avestada ***span-*** «it», Midiya dialektlərində ***spaka-*** «it» sözləri işlənmişdir. Qədim fars dilində bu söz qeydə alınmamışdır.

İran dillərinin tarixi fonetikasına dair aparılmış tədqiqatlarda göstərilir ki, qədim ***sp*** birləşməsi orta və yeni İran dillərinin cənub-qərb qrupunda qanunauyğun olaraq ***s***-ya keçmişdir: orta fars ***sak//sag***, klassik fars. ***sag***, müasir fars ***säg***, tat. ***sag***, tacik ***sag*** [208] və s. ***Sp*** birləşmiəsi İran dillərinin şimal-qərb qrupunda isə ***sp*** və ya ***sb*** şəklində qalmışdır (səslərin arasına əlavə sait artırılması mümkündür): talış ***sъpä*** semnan. ***esba***, qurani. ***sъpa*** [209] və s.

Göründüyü kimi, Quba dialektində işlənən forma İran dillərinin şimal-qərb qrupuna xas olan xüsusiyyəti saxlamışdır. Bəllidir ki, Azərbaycan dilinin Quba dialekti ilə İran dillərinin şimal-qərb qrupuna daxil olan yeni İran dilləri arasında heç bir əlaqə olmamışdır. Belə nəticəyə gəlmək olar ki, Azərbaycan dili ilə şimal-qərb qrupu İran dilləri arasında əlaqələr xronoloji cəhətdən daha qədim dövrlərdə baş vermiş və ya Quba dialektinə həmin söz Azərbaycan dilinin başqa dialekt və şivələri vasitəsilə keçmişdir. Onu da qeyd etmək lazımdır ki, hələlik başqa dialekt və

[207] Ərəb və fars sözləri lüğəti, s.677
[208] Расторгуева В.С. Сравнительно-историческая грамматика западноиранских языков (фонология). М., 1990, стр.128
[209] Yenə orada, s.128

şivələrimizdən Cəlilabad rayonu şivələrində ***sıpa*** sözü «eşşək balası» mənasında qeydə alınmışdır[210]. İran dillərindən fərqli olaraq Quba dialektində ***sıpa*** sözü yeni məna kəsb etmişdir. Burada o, «donuz balası» mənasını ifadə edir. -*U qədər yiyib kükəlib, lap* ***sıpaya*** *dönüb*.

***Sıpa*** sözünə Əbu Həyyanın «Kitab əl-idrak li-lisan əl-ətrak» əsərinin lüğət hissəsində rast gəlinir. Əsərin 2300 sözü əhatə edən türkcə-ərəbcə lüğət hissəsində müəllif ***sıpa*** sözünün «eşşək balası» mənasını qeyd etmişdir[211]. Əbu Həyyanın öz əsərində XIII əsrə qədərki türk dilinin qrammatikası, lüğət tərkibi haqqında bəhs etdiyini nəzərə alsaq, onda ***sıpa*** sözünün türk dillərinə keçməsi tarixi haqqında müəyyən təsəvvür əldə olunar. Hətta həmin dövrdə belə bu söz yeni məna kəsb etmişdir. Məlumdur ki, alınma söz keçdiyi dildə yeni məna qazanana qədər müəyyən inkişaf yolu keçir. Bu bir daha bizim yuxarıda söylədiyimiz fikri təsdiq edir.

Alınma sözlərin şərq qrupu dialekt və şivələrdə müxtəlif məna daşıması halları müşahidə edilir. Bu zaman həmin alınma sözlər eyni fonetik variantlarda çıxış edir. Misallara diqqət yetirək.

Lənkəran rayonu şivələrində ***kolaz*** sözü işlənir və «quş ovlamaq üçün ikinəfərlik qayıq» mənasını ifadə edir[212]. Biz həmin sözü Yardımlı rayonu şivələrində «qoyunları yemləmək üçün taxtadan düzəldilmiş axur» anlamında qeydə almışıq.

Lənkəran zonasında ***mirdo//mordov*** «axmaz, gəlməcə» anlamı ifadə edir. Şərqi Abşeron şivələrində isə ***mirdo*** «kir, çirk» mənasını bildirir[213].

***Səlitə*** sözü Masallı rayonu şivələrində «avara, işsiz» mənasında işlənir[214]. Həmin söz eyni fonetik variantda Yardımlı rayonu şivələrində «həyasız, utanmaz» mənasında qeydə alınmışdır. -*Ay* ***səlitə****, bəsdir, abrıvi bil; Nə* ***səlitə*** *uşağsan* (Y.).

---

210 Agayev Ə. Azərbaycan dilinin Cəlilabad rayonu şivələri. Nam. diss., Bakı, s. 202
211 Əsirəddin Əbu Həyyan Əl-Əndəlusi. Kitab əl-idrak li-lisan əl-ətrak. Bakı, 1992, s.34
212 Məcidova A.B. Azərbaycan dilinin Lənkəran şivəsi. Nam. diss., s.204
213 Велиева Г.. Лексика восточноапшеронских говоров азербайджанского языка. Канд. дисс., стр.28
214 Həmzəyev T.B. Azərbaycan dilinin Masallı rayonu şivələrinin lüğətinə dair // ADU-nun Elmi Əsərləri, Dil və ədəbiyyat seriyası, 1976, № 1, s.64

Tədqiq olunan dialekt və şivələrin bir çoxunda eyni mənada işlənən alınma sözlərə də rast gəlinir. Belə sözlər müxtəlif fonetik variantlarda çıxış edir. Misallara nəzər salaq.

***abxor*** (Sal.)//***oxur*** (Y., Ln., Lk., M.)//***oxır*** (C.) «bardaq, su qabı».

***bırxı*** (Ab.)//***bıxı*** (Ln., M.) «buxarı, divardakı soba»

***kavahin//kosun*** (Ab., Q.) «xışın ucuna keçirilən iti dəmir».

***purna//purni*** (Q.)//***pünə*** (Ln.) «yarpız».

Azərbaycan dilinin dialekt və şivələrinə keçmiş bu sözlərin fonetik variantları onların hansı dildən keçmələri haqqında müəyyən fikir söyləməyə imkan verir. Həmin fonetik xüsusiyyətlər isə tədqiqat obyektimizə daxil olan İran dillərinin xarakterik cəhətlərindəndir.

Bəllidir ki, tat dilinin ən mühüm xüsusiyyətlərindən biri rotasizm, yəni qədim İran ***d (***< ***t)*** səsinin inter- və postvokal vəziyyətdə ***r*** səsinə keçməsi hadisəsidir. Tat rotasizminin əlamətdar cəhətlərindən biri onun bütün nitq hissələrində özünü göstərməsidir[215]. Məsələn:

| **fars dilində** | **tat dilində** | **tərcümə** |
|---|---|---|
| amadän | amarän | gəlmək |
| didän | dirän | görmək |
| zädän | zärän | vurmaq |
| dud | durä | tüstü |
| näxud | näxür | noxud |
| yad | yar | yad, yaddaş |

Talış dilinin əsas fonetik xüsusiyətlərindən biri intervokal vəziyyətdə ***-d-*** səsinin düşməsidir. Məhz bu xüsusiyyət talış dilində felin məsdər şəkilçisinin ixtisarına səbəb olmuşdur[216]. Bu xüsusiyyət isimlərə də aiddir. Məsələn:

| **fars dilində** | **talış dilində** | **tərcümə** |
|---|---|---|
| madär | moä | ana |

[215] Hacıyev M. Tat dilinin Qonaqkənd ləhcəsi, s.12
[216] Миллер Б.В. Талышский язык. М., 1953, стр.55

| | | |
|---|---|---|
| zadä | zoä | oğul |
| boridän | bırie | kəsmək |
| zadan | žae//že | vurmaq |

Qeyd edilən xüsusiyyətləri nəzərə aldıqda ***purna//purni*** variantının tat, ***pünə*** formasının talış dilinə aid olması aşkar görünür. Həmin sözlərin fars dilində qarşılığı kimi
(pudine) «yarpız» sözü işlənir[217].

***Sül//sülm//silim*** (Ab., Q., İ.)//***sırd*** (Ln., M.) «nərdivan». Dialekt və şivələrimizdə qeydə alınmış bu sözlər üçün də İran dillərinin mühüm fonetik xüsusiyyətlərini nəzərə alaraq mənbə dili müəyyənləşdirmək olur.

İran dillərinin tarixi fonetikasında mühüm dəyişikliklərdən biri ondan ibarətdir ki, qədim ***rd, rz*** samit birləşməsi İran dillərinin şimal-qərb qrupunda qalmış, cənub-qərb qrupunda isə ***l*** səsinə keçmişdir[218]. Bu fonetik hadisəyə aid bir neçə misalı nəzərdən keçirək.

| ***Qədim İran dillərində*** | ***Orta İran dillərində*** |
|---|---|
| av. ***bərəzant*** «hündür» | |
| q. fars ***bŗδant*** «hündür» | orta fars ***buland*** «hündür» |
| av. ***pərətu*** «körpü, keçid» | ***pəhl*** «körpü, keçid» |
| av. ***sarəδ*** «il» | ***sāl*** «il» |
| q. fars ***δard*** | |
| av. ***barəziš*** «yastıq, balış» | ***bālıš*** «yastıq, balış» |

***Yeni İran dilləri***

| ***Cənub-qərb qrupu*** | | | ***Şimal-qərb qrupu*** | |
|---|---|---|---|---|
| ***kl. fars*** | ***m. fars*** | ***Tacik*** | ***Tat*** | ***Talış*** |
| sāl | Sål | sâl | sol | Sor |
| buland | Boländ | baland | boland | Barz |
| pūl | Pol | pul | pol | Pård |
| bāliš | Båleš | bôliš | boliš | boliš (fars) |

Tarixi fonetik qanunauyğunluğu nəzərə alsaq aydın olur ki, talış dilindəki ***sırd*** öz qədim formasını dəyişməmişdir. Həmin söz

---

[217] Персидско-русский словарь (под ред. Ю.А.Рубинчика), т.I, стр.312
[218] Расторгуева В.С. Сравнительно-историческая грамматика западно- иранских языков (фонология). М., 1990, стр.111

qanunauyğun olaraq fars və tat dillərində ***sil***, ***sül*** şəklinə düşmüşdür. Təsadüfi deyildir ki, tatdilli əhalinin yaşadığı Abşeron, Quba və İsmayıllı şivələrində ***sil***, ***sülüm*** fonetik variantları Lənkəran və Masallı rayonu şivələrində ***sırd*** forması qeydə alınmışdır. -*Bacım dam üstə çıxanda* ***sülümdən*** *yıxıldı (Ab.); Ay uşağ,* ***sırdi*** *gəti görək (M.);* ***Silimi*** *gətir, dama çıxacam (İ.).*

Alınma prosesi yalnız dildə yeni anlayışları ifadə etmək üçün sözlərin meydana çıxmasına deyil, eyni zamanda müxtəlif məna çalarlarının və ifadə rəngarəngliyinin artmasına da şərait yaradır. Bu mənada dialekt və şivələrin lüğət tərkibində İran mənşəli alınma sözlər omonim, sinonim və antonimlərin yaranmasında fəal iştirak edir. Onlar əsl Azərbaycan sözləri ilə olduğu kimi öz aralarında da sinonim, omonim və antonim münasibətlərə daxil olurlar.

### 3.1. Sinonimlər

Dilin lüğət tərkibini zənginləşdirən söz qruplarından biri kimi fonetik tərkibcə müxtəlif, məzmunca bir-birinə yaxın məna çalarlarını ifadə edən sözlər – sinonimlər dildə eyni sözlərin təkrarına yol vermir və xoşa gəlməyən hər bir ifadəni başqa biri ilə əvəzləməyə şərait yaradır.

Şərq qrupu dialekt və şivələrində İran mənşəli alınma sözlərdən sinonimlər müxtəlif səbəb və ehtiyaclardan yaranır. Belə səbəblərdən biri də həmin ərazidə yaşayan konkret dialekt nümayəndələrinin müxtəlif etnik qruplarla gündəlik ünsiyyətdə olmalarıdır. Nəticədə həmin dialekt nümayəndələri ünsiyyətdə olduqları qeyri-türkdilli qrupların dilindən xeyli leksik material mənimsəyirlər. «Müxtəlif etnik qruplarla ünsiyyətdə olan yerli dialekt sahibləri onlarla daha intensiv anlaşmaya nail olmaq üçün müəyyən məfhumu onların dilindəki sinonimlə işlətməyi etik-linqvistik zərurət sayır. Təkrar-təkrar baş verən bu proses, nəhayət, dialektin sinonim cərgəsində əcnəbi sözü fəallaşdırır və sabitləşdirir»[219].

---

[219] Vəliyeva G.Q. Şərqi Abşeron şivələrində sinonimlər // Türk dillərinin leksik-morfoloji quruluşu (Elmi əsərlərin tematik məcmuəsi). ADU-nun nəşri, Bakı, 1981, s.106

Şərq qrupu dialekt və şivələrində sinonim cərgələrini təşkil edən sözləri dil mənsubiyyəti baxımından aşağıdakı kimi qruplaşdırmaq olar:

### 3.1.1. Azərbaycan və İran sözlərinin sinonimliyi

a) Sinonim cərgəsini əmələ gətirən sözlərin biri dialekt, o birisi ədəbi dildə işlənir.
*bəndəm* (dial.) ~ *saplaq* (ədəbi dil) ~ *miçə//müçə* (dial.)
*sədə*f (dial.) ~ *düymə* (ədəbi dil) ~ *pilək* (dial.)
*tənə* ~ *sərki* (dial.) ~ *qaxınc* (ədəbi dil)
*dəsbəcə* (dial.) ~ *dərhal* (ədəbi dil)
*səryan* (dial.) ~ *mətbəx* (ədəbi dil)
b) Komponentlərin hamısı dialektlərdə işlənir
*ücə ~ dümüskil ~ dümbə*
*çuxur ~ düşbəraxur ~ dəngənə ~ dəmərdə*
*yovannıq ~ noxarış ~ qafun*
*gərdə//gərde ~ pin*

### 3.1.2. İran və rus dillərindən alınma sözlərin sinonimliyi

*siyəzi//sigezi ~ bardon ~ meşok*
*bələt ~ dəricə ~ vorota*
*sərdig ~ krişka*

### 3.1.3. İran dillərindən alınma sözlərin sinonimliyi

1. Fars dilindən
*peydəri ~ peşdapeşt ~ peydərpey* «fasiləsiz, dalbadal»
*sərcam ~ sərpuş ~ sərdik* «qapaq»
2. Fars və tat dillərindən
*gavahin* (f.) ~ *gosun* (t.) «xışın ucuna keçirilən iti dəmir»
*beybut* (f.) ~ *gərde//gorda* (t.) «bıçaq növü adı»
*lebəleb* (f.) ~ *sərə* (t.) «dolu»
*sələ* (f.) ~ *tasma* (t.)
*şəbpələ//şəppərə* (f.) ~ *şögərd* (t.) «gecəquşu»

3. Fars və talış dillərindən
*balaxana* (f.) ~ *ləm* (tal.)
*dəsgirə* (f.) ~ *şıp* (tal.) «səbət»
*xışım* (f.) ~ *mor* (tal.) «hirs, qəzəb, acıq»
*xanaxarab* (f.) ~ *kəxərob* (tal.) «evi yıxılan»
*təkər* (f.) ~ *tağırsağ* (tal.) «dolu»
4. Tat və talış dillərindən
*bəğələ* (t.) ~ *hındıl* (tal.) «böyürtkən»
*sülüm//silim* (t.) ~ *sırd* (tal.) «nərdivan»
*lağ* (t.) ~ *hiyə* (tal.) «kürək, bel»
*tou//tov* (t.) ~ *bıxı* (tal.) «ocaq, buxarı»
*oulə* (t.) ~ *ovələ* (tal.) «çiçək xəstəliyi»

### 3.2. Omonimlər

Azərbaycan dilinin dialekt və şivələrin lüğət tərkibini zənginləşdirən leksik kateqoriyalardan biri də omonimlərdir. Şərq qrupu dialekt və şivələrində omonimlərin yaranmasında İran mənşəli alınma sözlər də iştirak edir. Qeyd edilən dialekt və şivələrdə İran mənşəli alınma sözlər iki və daha çox mənaya malik omonimlər yaradır. Belə sözlərin içərisində fonetik cəhətdən dəyişikliyə uğramadan Azərbaycan sözləri ilə uyğun gələn leksik vahidlərə rast gəlindiyi kimi, eyni zamanda təsadüfi olaraq, tələffüzcə Azərbaycan sözləri ilə səsləşən alınmalar da müşahidə olunur. Aşağıda omonimlərə aid bir neçə misal verilir.

baca, nəfəslik (Sal.)

| | |
|---|---|
| ban | dam |
| | arabanın korpusu (C., M., Sal., Y.) |
| | |
| | xışın bir hissəsi (B., Q., Ln., Ş.) |
| bazı//bazu | təpə, dik, hündür yer (Br., Sal.) |
| | bilərzik, qolbaq (İ.) |
| | |
| | qaramal saxlanan yer |
| binə | bünövrə, başlanğıc (Ln., Y.) |

yad, naməhrəm (Ş.)
biruni bayır imarət (B.)

dahar qayalıq, daşlıq sahə (Ab., Q.)
bitgi adı (Y., Ln.)

dəstə 1)əl tutan yer; 2) bağlanmış göyərti
3) 6-7 yaşlı, ağlı kəsən (uşaq) (A., Ab., C.., Ln., M.,)

əng çənənin alt hissəsi
arı (B.)

zing qılça sümüyü (B., S.)
kiçik salxım (B., Sal.)

400 q (ölçü vahidi) (Y.)
istil çəltiyi suvarmaq üçün kiçik su anbarı (Ln.)

az
kəm xəlbirin bir növü (Ab., Sal.)
xəstəlik adı (atda) (Q., Y.)

kötük (Ab., Ln.)
kündə xəmir kündəsi

bozumtul (rəng) (Ab.)
kürünc taxıl saxlamaq üçün yer (Ln.,Y.)

alaq otu (Y.)
ger ördək cinsindən olan quş adı (Ln.)

bıçaq növü (B.)
gərde saman xırdası (B., Q.)

bir parça (Y.)
lata quş tutmaq üçün tələ (Y.)

| | |
|---|---|
| | yanaq (B.) |
| künə//kuna | əyirici oxun küt tərəfi (çəhrədə) (Q., Y.) |
| | darısqal, dar (B., Q., Ln.) |
| təng | araba hissəsinin adı |
| | plovun qarası |
| xuruş | acıq, qəzəb (Y.) |

## 3. 3. Antonimlər

Şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli sözlər arasında çoxlu omonim və sinonimlərə rast gəlindiyi halda bunu antonimlər haqqında demək olmaz. Alınma sözlər arasında çox az miqdarda əks mənalı leksik vahidlər müşahidə edilir. Onları aşağıdakı kimi qruplaşdırmaq olar.

1)Azərbaycan və İran mənşəli sözlərin antonimliyi:
*kök – ləvərə* «arıq, zəif» (Q., Y.)
*çox – kəm* «az» (əksər dialektlərdə)
*küt – tic* «iti» (Q.)
*cücərmək – pəlişkəmək//pölişkəmək* (Ln., C.) «solmaq»

2)İran sözlərinin antonimliyi:
*biyəndəcər* «kifir» (Ab.) – *xoc* «qəşəng» (A., Ln., M.)
*səvard* «çəltik tarlasının başlanğıcı» (Ln.) – *payin* «çəltik tarlasının sonu, qurtaracağı» (Ln.)
*duraz* «uzun» (Q.) – *kütah* // *güdə* «qısa» (əksər dialektlərdə)
*ləvərə* «gücsüz, zəif» (Q., Y.) – *zəbərdəst* «güclü» (C.)
*səyxaş* «sakitlik» (B.) – *vurmabizən* «qarışıqlıq» (B.)
*nərəxər* «böyük» (Q.) – *püsküri* «balaca» (Q.)
*miyançı* «vasitəçi» - *müzəbzəbi* «aravuran» (Ln.)

## 3.4. Alınma sözlərin tematik qruplar üzrə bölgüsü

Şərq qrupu dialekt və şivələrinin leksikasında işlənən İran mənşəli alınma sözlərin əksəriyyəti konkret anlayış və məfhumları

ifadə edən təkmənalı leksik vahidlərdir. Belə sözlərin çoxu dialekt leksikasında özünün nominativ mənasında çıxış edir. Bu da onunla izah olunur ki, həmin dialekt nümayəndələrinin çoxu ikidillidir. Bu sosial faktor onlara imkan verir ki, alınma sözlərin əlaqədə olan dillərdəki mənalarının eyniliyini nəzarət altında saxlasınlar.

Şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli sözlər ilk növbədə yerli şərait, həyat tərzi, adət-ənənə və məişətlə bağlı söz və terminlərdən ibarətdir. Onları aşağıdakı tematik qruplara bölmək olar.

### 3.4.1.Bədən üzvlərinin adları

küna «yanaq» (B.), küşt//küşd «bel» (Q.), zing «qılça sümüyü» (B., S.), miçə «kirpik» (B.), tən «insan və heyvan bədəninin bir üzvü, qarnın aşağı hissəsi» (Y.), tənə «qulağın yumşaq hissəsi» (Ə., B.), xılx «boğaz, xirtdək» (Y., C.).

### 3.4.2. Zaman məfhumu bildirən sözlər

adına//adinə//adna «cümə axşamı, cümə» (Y., Ln., Sal., Ş.), giləy (naharı) «saat 11-12 radələri» (Ln.), çeşnə «günorta» (Ln.).

### 3.4.3. Təbiət hadisələri ilə bağlı söz və terminlər

deşdavar «qərb küləyi» (Ln., Sal.), germiç//gərmic «isti cənub küləyi» (Y., C.), təkər «dolu» (Q.), tağırsaq «dolu» (A., Ln., M.), hır «çən» (Ln.).

### 3.4.4. Heyvan adları

vəcə «keçi balası» (İ.), dıbır//dübır «ikiillik keçi» (Q., İ., Y., S.), lüs «çöl pişiyi» (Ln.), xərənozi «iri pişik» (B.).

### 3.4.5. Cücü və həşərat adları

giçəh «kənə» (Q.), liləpər «kəpənək, barama kəpənəyi» (Ln., Y.), mələ «taxtabiti» (Ln.), mic «quş və ya toyuq biti» (Ln., Sal.),

müzə «mozalan» (C.), mizanqul «milçəkyeyən böçək» (Ln., M.), püsküri «balaca uçan bəcək» (Q.), mız «uçan xırda həşərat» (Ab.).

### 3.4.6. Ağac adları

vən «cökə» (Ln., M.), molol «qızılağac» (Ln.), nil «oduncağı bərk ağac növü» (A., Ln., Q.), razdar//rəzdar «göyrüş» (A., Ln., Lk., M.).

### 3.4.7. Bostançılıqla bağlı söz və terminlər

bumərişə «yerkökü» (A., Ln., Lk., M.), kudi//küdü «balqabaq» (B.), gərmək «tez yetişən yemiş növü» (B., Ln.), gülbəsər «xiyar» (C.), nimras «yarı yetişmiş qarpız» (B.), püşraz qarpız «tez yetişən qarpız növü» (B.), zərdi «yerkökü» (B.).

### 3.4.8. Quş adları

bili «ördək» (Ln., M.) // bili «ördək balası» (Sal.), bibikinə «seyidquşu» (Ln.), vərdi «bildirçin» (M.), qəçələ «saqsağan» (Q., Ln.), döküə «ağacdələn» (Ln.), düməsincə «quş adı» (Ln.), zərd «sarıköynək» (B.), kəvələ «dimdiyi uzun quş adı» (Ln., Y.), ger «çöl ördəyi» (Ln.), gəraf «əti yeməli, ördəyəbənzər quş, turabi» (Ln., M.), siyokijə «qaratoyuq» (Ln., M.), soləkafti «vəhşi göyərçin» (Ln.), şinəbub «şanapipik» (B.), car//şor «sığırçın» (Ab., ln.).

### 3.4.9. Balıqçılıqla bağlı söz və terminlər

anqıl «tor toxunan xana» (Ln.), bul «balıq ovunda istifadə olunan iki və ya üç dişli dəmir alət» (Ln.), domijə//doməxolə//domujacıq «balıq toru» (Ln.), züngə «balıq toru üçün dənizdə qurulan dayaq» (Ln.), külmə «balıq növü adı» (Ln.), zərdəpər «balıq növü adı» (Ln.), moloşk// molışk «böyük balıq toru» (Ln.), pori «balıq növü» (ƏB.), sim «pulcuq» (balıqda) (Ln.),

sıf «ağ balıq» (Sal.), sılfant «balıq torunda olan qurğuşun halqa» (Ln.), soli//sol «xırda, körpə balıq» (Ln., Sal.).

### 3.4.10. Gəmiçiliklə bağlı söz və terminlər

kolaz «qayıq» (Ln.), payan «avar» (Ln.), ləvəsə «avar» (Ln.), çöp «avar» (Ln., Sal.), çəpkeş «avarçəkən» (Sal.), pəlvənd «gəmidə dor ağacını saxlayan iplər» (Ln.), pəlvəndər «yelkəni çəkən iplər» (Ln.).

### 3.4.11. Geyim əşyalarının adlarını bildirən sözlər

məndil «ləçək» (Q.), zərəndaz «zərli baş örtüyü» (Ln.), nimtənə «qadın libası» (B., Ln.), setrə «astarsız pencək» (C.), safut «küləş(dən düzəldilən) papaq» (Q.), tasküla «araqçın» (B.), şəbküla//şəpkülə//şəpkülah «keçəpapağı» (B., M., C.), şətəl «yun corab» (Q., Ş.).

### 3.4.12. Zinət və bəzək əşyalarının adlarını bildirən sözlər

qilində//qilindənə//qılındov «boyunbağı» (B., Q.), dəstə-nə//destinə//dəsinə «qolbaq, bilərzik» (B., Ln.), kərdənnik «boyunbağı növü» (Sal.), səngisitarə «boyunbağıya keçirilən qiymətli qaş-daşın bir növü, ulduz başı» (Lk.), həxıx «gümüşlə işlənmiş boyunbağı» (Lk.).

### 3.4.13. Meyvə adları

bəli//bəhli «gilas» (Q.), dambul «cır gavalı» (B.), dammılı «gavalının iri növü» (Sal.), goarmıdı «iri armud növü» (Q.), nənəbizi//məməbüzi//məməbizi «çiyələyin və böyürtkənin keçiəmcəyinə oxşar bir növü» (Q.), panakun «armud növü» (Q.), hındıl «böyürtkən» (Ln., M.), hüllə «armud» (A., Lk., Ln., M.), bəğəli «moruğ» (Q., Ş.).

### 3.4.14. Bitki adları:

#### 3.4.14.1. Dərman bitkilərinin adlarını bildirən sözlər

vişdənə «küncütə oxşar bitki, yaranı deşmək üçün istifadə olunur» (Ln.), purna//pürni «yarpız» (Q.), pünə «yarpız» (Ln.), gərməkiyo//gərməgiyo «mədədəki qurdu tökmək üçün qaynadılıb suyu içilən ot» (Q.), şingilə «itburnu» (Ln., M.).

#### 3.4.14.2. Yabanı bitki adlarını bildirən sözlər

bır «tikan» (Ln., M., C.), vel «qıjıotu» (A., Ln., M.), qəzənə//geznə//gəzənə//gəznə «gicitkən» (B., İ., Ln., M.), dala//dalə «qamışın bir növü» (Ln., S., Sal.), zərgend//zənget «yabanı bitki adı» (Y., Ln., M., C.), ker «alaq otu» (Y.), lığ//liğ «bataqlığda sucaq yerdə bitən bitki növü adı» (Q., Ln.), qənəptum «kəndir toxumu» (Q.), pizə//püzə «həsir toxumaq üçün bitki növü» (Ln., M.), sir «yabanı sarımsaq» (İ.), vəcələ «yabanı soğan» (Ln., Y.), xərəçohri «yovşan» (İ.), tılakeşniş «yabanı keşniş» (Ln.), şing «yemlik» (İ).

### 3.4.15. Yemək, içki, ağartı və s. ilə bağlı söz və terminlər

ardava «undan hazırlanan yemək növü» (Q.), bürüşdə «qızarmış, yaxşı bişmiş çörək» (B.), dancə//dancənə «doğramac» (Ln.), dastana// dəsdana «təndir çörəyi» (B.), lülə «qoğal içi» (B.), yağlıpiyaz «soğan qovurması» (Q.), ləvəngi «xörək adı» (A., Lk., Ln., M.), lökü «düyü unundan bişirilən çörək» (Ln.), noxarış «yavanlıq» (Ab., B.), nümri «yağda bişirilmiş, lakin qarışdırılmamış yumurta» (B.), ovşala//öhşələ «şərbət» (B., Q.), mədd «meyvə şirəsi» (A., Lk., M.), ovduğ «qatığ və suyun qarışığından hazırlanan içki» (Y., Ln., M., Br.), pencəkeş «təndir çörəyi; lavaş» (Br., ƏB., S.), pətə «yağda qızardılmış müxtəlif bişmiş» (Ln.), tarava «göyərtidən hazırlanan yemək» (Q.), xırş «ağız, heyvanın ilk südü» (İ.), şıtni «unu südlə qarışdırıb yağda bişirilən nazik kökə» (Ln., M.), şirava «südlü sıyıq» (B.), cır «kəsmik» (Ln.).

### 3.4.16. Xəstəlik adlarını bildirən sözlər

qandımə «it dirsəyi» (A., Lk., Ln., M.), qəmijə «səpki (isitidən)» (Ln., M.), əno//ənov «yetişməmiş meyvə, yemək nəticəsində əmələ gələn xəstəlik» (B., Ln.), zərdi «sarılıq» (B., Q., Ln.), isbirə «boğaz xəstəliyi» (C.), isbirə «ağız nahiyəsinin kənarlarında ağ rəngli uçuqların olması ilə müşayiət olunan xəstəlik» (Q.), oulə//ovələ «çiçək» (Q., Ln., M.), xanəzir // xanəzil «boğaz uru» (İ., Y., Ln., M.), çəşpilə «gözün altının şişməsi» (ƏA., Ln., M.).

### 3.4.17. Kənd təsərrüfatında istifadə olunan alət və onların hissələrini bildirən söz və terminlər

bazı//bazu//bozi «xışın kötüyünü boyunduruqla birləşdirən hissə» (A., B., Q., Ln., Lk., Sal., C., Ş.), ban «arabanın yük yeri» (Y., M., Sal., C.), əvəndə//əvəndənə «boyunduruğa bağlanan qayış» (Ln., Ş.), dəndə «araba təkərinin barmaqlıqları» (B., Q., Ln.), giv//givə «boyunduruq» (Ln., Sal., C.), gosun «xışın ucuna keçirilən iti dəmir» (Q.), kərdənəməd «xamut» (Sal.), müjdü//mıştə «xışın dəstəyi» (ƏB., Ln., Sal.), kiozən «otu təmizləmək üçün iti alət» (B., Q.), sinəbənd «samıbağı» (Q., İ.), sinəçülə//sinəçi «samı» (büt.d.).

### 3.4.18. Ev, digər tikililər və onların hissələrinin adlarını bildirən söz və terminlər

ban «baca, nəfəslik» (Sal.), biruni «bayır imarət» (B.), balaxana «yayda istirahət üçün yer, külafirəngi» (A., Ln., M.), dərxanə «saray» (C.), dərosər «qapı və pəncərə üstünə atılan taxta» (A., Ln., M.), go$^{-u}$dan // godan «tövlə» (B.), kəşivan «eyvanın kənarları» (Q.), kürünc «buğda saxlamaq üçün anbar» (Y.), serdabə «zirzəmi» (Q.), sərəqət//sərəqit «damla divarın və pərdilərin arasında qalan boşluq» (Q.), tənəbi «böyük otaq, qonaq otağı» (Ln., M., Y.), to$^{-u}$//tov «divarın içində olan ocaq, buxarı» (B.), səryan «mətbəx» (Ş.), təndirəsər «təndir qoyulan yer» (L., M., C.), comoxu-dun//camaxatan//cəməxudun «yük yeri, yorğan-döşək yığılan yer»

(B., Q.), şiləsər «eyvan» (Q.), bıxı «buxarı» (Ln., M.), züvərdar//zəvərdar «qapı üstü» (Ab., B.).

### 3.4.19. Məişətdə işlənən əşyaların adlarını bildirən söz və terminlər

ambur «kəlbətin» (B.), beybut «iri bıçaq» (B.), bəsdi «kiçik gil qab» (Ab., Ln.), biləng «yaba» (M.), bürgöz//bürgəz «tikandan düzəlmiş süpürgə» (Y., Ln., M., Sal.), vərdənə «yoğun oxlov» (Lk., Sal.), dəmkeş «qazan, samovar və b. seylərin ağzına qoyulan mis qapaq» (B.), dasdar //dassar //səngdasdar «əl dəyirmanı» (A., Q., Ln., M., Y., C.), dəngənə «saxsı boşqab» (Q., Ln., Ş.), dəmər-də//dəhmərdə «saxsı dərin boşqab» (B., ƏB., Ln., S.), dəsgirə «səbət» (B., Q., Ln.), düsəri «hər iki tərəfi iki mismar» (B.), ərə//hərə//hərrə «mişar» (B., ƏB., Ln., M., Sal., C.), gasi «təndir ağzına qoyulan qapaq» (Q.), gərdə//gorda//kort//kiləğurt «iri bıçaq» (B., Br., Q., Ln., M., C.), ləbgərdən «abgərdən» (Ş.), masqur //mas-qura «balaca saxsı kasa» (B., Q., İ., Y., Ln., M., Sal., C.), məməkdan «duzqabı» (İ., Sal.), nimdar//mindər «döşəkcə» (A., B., İ., Ln., M., Sal., Ş.), abxur//oxır «su qabı, bardaq» (A., Ln., M., S., C.), pəltə «isti şeyləri götürmək üçün əski, qabgötürən» (Ln., M.), picənə «başda yük aparmaq üçün burulmuş dairəvi parça» (Ln., M.), sərdig «qazan qapağı» (Q.), sil «həsir toxumaq üçün ağac alət» (Ln., Sal.), silim//sülüm//sırd «nərdivan» (B., Q., İ., M.), siəzi // sigəzi // siyəzi «kisə» (büt.d.), sıpaya «sacayağı» (S.), kinarə «ocaq» (Ln.), suxura «çini qab» (Q., Ln.), çiben «asmalıq» (Ln.), çin «oraq» (Q., Y., Ln., M.), şitqur «süd qabı» (Ln.), şirəpus//şirəpuz «divarı ağartmaq üçün istifadə edilən bir parça dəri» (B., Ln., Ş.), şıp «uzunsov səbət» (Ln.) .

### 3.4.20. Toy adətləri ilə bağlı sözlər

olatəbırın «paltarkəsdi» (A., Ln., M.), sərtaxti «toyun 7-ci günü gəlini görməyə gələnlərin gətirdikləri xonça və ya hədiyyə» (Ab.), xüvarvara «gəlinin sağdış-soldışı» (Ab.), hırdabı//hırdaboy «toydan

qabaq oğlan evindən qız evinə göndərilən düyü, yağ və s. aparılması mərasimi» (A., Ln., M.).

### 3.4.21. Əlamət və keyfiyyət bildirən sözlər

kütün//kütin «qozbel» (Y.), təlh//təlx «acı» (M.), tünik//tünük//tənik «nazik, həssas» (B., Q., Y., Ln., M.), saxt//səxt «bərk» (M.), səlitə «avara, işsiz» (M.), siyapur//siyapır//siyafur «həyasız» (B., Q., ƏB., M., Sal., C., Ş.), sital «nadinc, sözə baxmayan» (B., Q., İ., Y.), xərəngə «ədəbsizlik edən» (Ab.), xül «qarınqulu» (Ab.), cəlidə «kimsəsiz» (Sal.), canəzir//canəzil «xəstə» (Ab., Lk., Ş.), şətəl «sözə baxmayan, nadinc» (B., L., M.) .

## 3. 5. Toponimlər

Azərbaycan dilinin bir sıra problemlərinin işıqlandırılmasında əvəzsiz əhəmiyyət kəsb edən dialekt və şivə leksikasının toponimlərin öyrənilməsində də rolu böyükdür. Azərbaycan toponimlərinin linqvistik təhlili göstərir ki, onların yaranmasında alınma sözlər fəal iştirak edir. «Azərbaycan toponimiyasında elə coğrafi adlara rast gəlinir ki, onlar Azərbaycan dili ilə qədimdən əlaqə və münasibətdə olmuş ərəb, fars, eləcə də dialekt və şivələrimiz səviyyəsində Qafqaz, İran dillərindən alınan sözlərdən düzəlmişlər»[220].

Azərbaycan və İran dillərinin qarşılıqlı əlaqələri Azərbaycan toponimiyasında da müşahidə olunur.

Araşdırmalardan aydın olur ki, Azərbaycanın şərq zonasının toponimiyasında mühafizə olunmuş və eyni zamanda həmin dialekt və şivələrdə işlənən İran mənşəli leksik vahidlər ya konkret coğrafi obyekt adlarını bildirməyə, ya da müəyyən coğrafi adı formalaşdırmağa xidmət edən apelyativ sözlərdən ibarətdir.

Azərbaycanın İran mənşəli toponimlərinin xarakterik xüsusiyyəti mürəkkəb quruluşlu olmasıdır. Belə toponimlərin formalaşmasında ***ab, vel, dahar, di, peştə, ru, sər, tanq//təng*** və s. söz və terminlər fəal iştirak edir. Qeyd edilən sözlər Azərbaycan

[220] Əhmədov T. Azərbaycan toponimikasının əsasları. Bakı, 1991, s.73

dilinin dialekt və şivələrində ya müstəqil leksik vahid kimi, ya da sözlərin tərkibində işlənir.

Azərbaycan toponimiyasında İran layına aid olan toponimlərin formalaşmasında fəal surətdə iştirak edən leksik vahidlərdən biri «ab» sözüdür. Tərkibində ***ab*** sözü işlənən coğrafi adlar əsasən hidronimlərlə bağlıdır. Bununla yanaşı, bəzi hallarda o, hidronimik oykonimləri də bildirməyə xidmət edir. Dialekt və şivələrimizin leksikasında ***ab*** sözünün ***ab//ov//o//u*** fonetik variantlarda işləndiyini görmək olur. Maraqlı cəhət bundan ibarətdir ki, ***ab*** sözünün həmin fonetik variantlarını Azərbaycan toponimiyasında da müşahidə edirik: *Gəndab* (Dəvəçi rayonunda bataqlıq adı), *Vərov* (Yardımlı rayonunda kənd adı), *Siyov* (Lənkəran rayonunda çay), G*əndo* (Abşeron rayonunda çay), *Mürdo* (Quba rayonunda bataqlıq adı), *Ugah* (Dəvəçi rayonunda kənd adı).

Azərbaycanın şərq zonasının toponimiyasında *Təngə // Təngi* (Quba rayonunda dərə adı), *Təng* (Yardımlı rayonunda sıldırım dağların arasından keçən dar keçid), *Təngəaltı* (Quba rayonunda yer adı), *Təngərud // Təngəru* (Astara rayonunda çay) kimi toponimik adlarda mühafizə olunmuş ***təng*** sözü dialekt və şivələrimizdə «dar, darısqal, ensiz» mənalarında qeydə alınmışdır. Misal göstərilən coğrafi adlarda da ***təng*** sözü həmin anlamda çıxış edir. Bu söz əsasən oronimlərin yaranmasında iştirak edir.

Məhdud ərazidə coğrafi adların yaranmasında iştirak edən leksik vahidlərdən biri ***poçə*** sözüdür. Bu söz Yardımlı rayonu şivələrində «yamac» mənasında qeydə alınmışdır. ***Poçə*** sözü həmin rayonun ərazisində mikrotoponimlərin formalaşmasına xidmət edir. Aşağıdakı mikrotoponimlər diqqəti cəlb edir.

***Armudlu poçə*** (Yardımlı, Hamarkənd) «armudlu yamac» mənasını bildirir. ***Bənəpocə*** (Yardımlı, Hamarkənd) – talış ***vən*** «ağac növü adı», ***-ə*** şəkilçisidir, «vən ağacının çox olduğu yamac» anlamını bildirir.

***Aborə poçə*** (Yardımlı, Odurağaran kəndi). M.Məmmədov bu mikrotoponimin birinci hissəsindəki ***aborə*** sözünü talış dilindəki ***ambur*** «cır armud» ilə izah edir[221].

[221]Мамедов М.А. Лингвистический анализ географических названий Азербайджана (на материале Ленкоранской низменности). Докт. дисс., Джизак, 1984, с.249

***Dozəpocə*** (Yardımlı, Bürzünbul kəndi). Bu mikrotoponimin izahını M.Məmmədov belə verir: «***dozə*** talış ***donzə*** «on iki», ***pocə*** «təpə»[222]. Belə çıxır ki, ***Dozəpocə*** «on iki təpə» deməkdir. Bizim fikrimizcə, mikrotoponimin mənası düz açılmayıb. Hər şeydən əvvəl, qeyd edilməlidir ki, ***pocə*** sözü «təpə» mənasında nə talış, nə də başqa İran dillərində işlənmir. Bu söz talış ***po*** «ayaq» və ***cə*** «yer» sözlərinin birləşməsindən yaranan mürəkkəb leksik vahid olub «yamac» mənasını ifadə edir və həmin mənada Azərbaycan dilinin Yardımlı rayonu şivələrinə keçmişdir. Mikrotoponimin birinci hissəsindəki **dozə** isə ***doz*** < ***düz*** sözündən və talış dilində sifət düzəldən **-ə** şəkilçisindən ibarətdir. Beləliklə aydın olur ki, ***Dozəpocə*** «düz yamac, hamar yamac» deməkdir.

***Böyük pocə*** (Yardımlı) – böyük yamac deməkdir.

***Lümə pocə*** (Yardımlı, Vərgədüz kəndi) – talış ***lümə*** «qısa» və *pocə* «yamac» sözlərindən yaranmışdır.

***Serəpocə*** (Yardımlı, Hamarkənd kəndi) – talış ***ser*** «əzgil», ***ə-*** şəkilçi, «əzgilli yamac» mənasını ifadə edir.

Quba-Dəvəçi zonasında tatların kompakt yaşadığı ərazidə isə coğrafi adların tərkibində ***kələ*** sözünə rast gəlinir. Tat dilində «böyük, uca» mənasında işlənən kədə sözü Azərbaycan dilinin Quba dialektinə keçmiş sözlərin tərkibində də eyni mənanı ifadə edir. Həmin zonada mikrotoponimlərin yaranmasında fəal iştirak edir.

***Kələzimi*** (Xaşı kəndi) – ***kələ*** və ***zimi*** «zəmi» sözlərindən yaranmışdır. Böyük əkin sahəsinin adıdır.

***Kələku//Kələkuh*** – Quba rayonu Puçuq kəndinin yaxınlığındakı uca dağın adı.

***Kələüşə*** – Qonaqkənddə nəhəng ağacları olan meşə sahəsinin adı, «Böyük meşə» mənasını ifadə edir.

***Kələdəhnə*** – Dəvəçi rayonunda çay adıdır.

Azərbaycanın şərq zonasında yuxarıda qeyd edilənlərdən əlavə dərə, kəl, bataqlıq və s. adları bildirən çoxlu sayda mikrotoponimlərə rast gəlinir ki, onların izahında dialekt və şivələrimizin materialları mühüm rol oynayır. İki və daha çox sözdən yaranan, mürəkkəb quruluşlu belə toponim və mikrotopo-

[222] Yenə orada, s.284

nimlərin bəzən hər iki komponenti İran mənşəli sözlərdən, bəzən isə bir tərəfi Azərbaycan, digər tərəfi isə İran mənşəli leksik vahidlərdən ibarət olur. Aşağıda bu qəbildən olan bəzi toponimlər nəzərdən keçirilir.

1. Hər iki komponenti İran mənşəli sözlərlə ifadə olunan yer adları.

***Velədi*** (Lənkəran rayonu) – talış ***vel*** «ayıdöşəyi « ***-ə*** şəkilçi, ***di*** «kənd».

***Biyəru*** (Astara rayonu) – talış ***bi//biyə*** «buz», ***ru*** «çay».

***Bırsüt*** (Astara rayonu) – talış ***bır*** «tikanlı kol», ***süt*** < ***süte*** «yanmaq» felinin kökü.

***Qədərü*** (Astara rayonu) – talış ***qədə*** «kiçik, balaca» və ***rü*** «çay».

***Yoləhi*** (Yardımlı rayonu) – talış ***yol*** «böyük» **-ə** şəkilçi, ***hi*** «yer, sahə».

***Kanəkumon*** (Yardımlı rayonu) – talış ***kanə*** «köhnə», ***kümə*** «tövlə», ***-on*** cəm şəkilçisi. «Köhnə tovlələr olan yer» deməkdir.

***Subrədahar*** (Quba rayonu) – tat ***sübi*** «ağ» ***-rə*** bitişdirici ünsür, ***dahar*** «qaya, təpə».

***Kündahar//Kundahar*** (Quba rayonu) – tat ***kün//kun*** «dib, aşağı hissə» və ***dahar*** «qayanın aşağı hissəsi, dibi» mənasını bildirir.

***Kələsənq*** (Quba rayonu) – tat ***kələ*** «böyük, uca», ***sənq*** «daş». «Böyük daş» deməkdir.

***Qamov*** (Astara rayonu) – talış ***qam*** «isti», ***ov*** «su». «İstisu» mənasını ifadə edir.

***Yoləmarzon*** (Lerik rayonu) – talış ***yol*** «böyük», ***-ə*** şəkilçi, ***marz*** «ayırıcı sərhəd, mərz», ***-on*** cəm şəkilçisidir. «Böyük mərzlər» mənasında işlənir.

***Bəleton*** (Lənkəran rayonu) – talış ***bəlet*** «həyət qapısı, alaqapı», ***-on*** cəm şəkilçisi.

2. Komponentləri Azərbaycan və İran mənşəli sözlərlə ifadə olunan yer adları.

***Qədədik*** (Astara rayonu) – talış ***qədə*** «balaca, kiçik» və azərb. ***dik*** «zirvə, hündür yer». «Kiçik zirvə» mənasında işlənir.

**Bandiki** (Yardımlı) – talış ***band*** «dağ», azərb. ***dik***.

***Duruzəbaxça*** (Quba rayonu) – tat ***duruz*** «uzun» və ***baxça***. «Uzun baxça» mənasını ifadə edir.

***Ləjlər*** (Yardımlı rayonu) – talış ***ləj*** «sucaq yer» azərb. ***-lər*** cəm şəkilçisi.

***Sitalçay*** (Quba) – tat ***sital*** «nadinc» və azərb. ***çay***. «Dəli çay» mənasında işlənir.

***Köhnədahar*** (Abşeron rayonu) – azərb. ***köhnə*** və tat ***dahar*** «qaya, təpə».

***Mərzlər*** (Yardımlı rayonu) – ***mərz*** və azərb. ***-lər*** cəm şəkilçisi.

***Kerlik*** (Lerik rayonu) – talş ***ker*** «daş» və azərb. ***-lik*** məkan bildirən şəkilçi.

***Mijnəyurd*** (Yardımlı rayonu) – talış ***müjnə*** > ***mijnə*** «qarışqa» və azərb. ***yurd***.

Yuxarıda sadalanan yer adlarını nəzərdən keçirdikdə aydın olur ki, onların komponentlərini təşkil edən bu və ya digər İran mənşəli söz Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində ya müstəqil leksik vahid kimi, ya da sözlərin tərkibində işlənir. Bu da həmin yer adlarının öyrənilməsində dialekt və şivələrimizin materiallarından istifadə edilməsinə geniş imkanlar açır.

## NƏTİCƏ

1.Azərbaycan və İran dillərinin qarşılıqlı əlaqələrinin dərin tarixi kökləri var. Bu tarixi əlaqələr türk və irandilli xalqların ictimai, iqtisadi və mədəni həyatının bütün sahələrində olduğu kimi onların dillərində də öz əksini tapmışdır. Bu müddəa tarixi və linqvistik faktlarla təsdiqlənir. Həmin faktlara əsasən türk-Azərbaycan və İran dil əlaqələri elmi ədəbiyyatda artıq təsbit olunmuş kanonik dövrləşdirmələr çərçivəsinə sığışmır və xronoloji cəhətdən daha qədim dövrlərdən başlayaraq öyrənilməlidir.

2.Azərbaycan dilinin şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli sözlər üzərində aparılan araşdırmalar Azərbaycan-İran dil əlaqələrinin ictimai faktorlarla bağlı olduğunu da göstərir. Azərbaycan-İran ikidilliliyi bu ərazidə yaşayan irandilli xalqların sosial keyfiyyətlərindən biridir və onların siyasi-ictimai tarixi vəziyyətindən asılı olaraq həmişə mövcüd olmuşdur.

3.Əldə olan və araşdırılan material belə bir faktı qeyd etməyə imkan verir ki, şərq qrupu dialekt və şivələrinə İran dillərindən söz alınması prosesi eyni formada baş vermir. Bu qeyri-bərabərlik alınma sözlərin mənimsənilməsinin müxtəlif səviyyələrində nəzərə çarpır. Dialekt leksikasına daxil olmasının mənbəyinə görə də İran mənşəli sözlərdə müxtəliflik özünü göstərir. Şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli sözlər tələffüz normalarını əks etdirdiyindən, yəni gündəlik ünsiyyət əsasında şifahi yolla keçdiyinə görə tədqiq olunan zonanın müxtəlif ərazilərində onların çoxvariantlılığı müşahidə olunur. Fars dilindən Azərbaycan ədəbi dilinə keçmiş (və ya nə vaxtsa ədəbi dildə işlənmiş) sözlər üçün belə variantlılıq xarakterik deyil, yaxud ola bilər ki, həmin sözlərin Azərbaycan dilində işlənməsinin ilk dövrlərində mövcud olmuşdur. Bir çox hallarda isə alınma sözlərin çoxvariantlılığına müxtəlif İran dillərinin əlaqələrinin nəticəsi kimi yanaşılmalıdır.

4.Şərq qrupu dialekt və şivələrində alınma sözlər müəyyən fonetik dəyişikliklərə məruz qalır. Onları 1) Azərbaycan və İran dillərinin fonetik strukturca fərqlərinə əsaslanan sistem dəyişiklikləri və 2) Azərbaycan dilinin, onun dialekt və şivələrinin daxili fonetik qanunauyğunluqları əsasında baş verən sistemdaxili dəyişikliklər kimi qruplaşdırmaq olar. Alınma sözlərin

mənimsənilməsi Azərbaycan dilinin, onun şərq qrupu dialekt və şivələrinin fonetik qanunlarına uyğun olaraq baş verir. Bununla yanaşı tədqiq olunan ərazidə İran dillərinin təsiri ilə müəyyən fonetik hadisələr müşahidə olunur.

5.Şərq qrupu dialekt və şivələrində İran mənşəli sözlərin morfoloji mənimsənilməsi prosesi Azərbaycan dilinin qrammatik strukturunun təsiri ilə baş verir. Onlar Azərbay- can dilinin morfoloji sisteminin qanunlarına əsasən dəyişir, yəni flektivlikdən aqlütinativliyə keçir; sözün forması fleksiya yolu ilə deyil, kökə müəyyən şəkilçilərin (kəmiyyət, hal, mənsubiyyət və s.) artırılması yolu ilə baş verir. Azərbaycan dilində şəkilçilərin təkmənalılığı alınma sözlərin tez mənimsənilməsinin şərtlərindən biridir. Alınma sözlərin əksəriyyəti isimlərdən ibarətdir. Buna səbəb təkcə dilxarici faktor deyil (çünki əsasən nominantlar alınır), eyni zamanda dilin xarakteri də rol oynayır. Azərbaycan dilində ad (isim) əsası başqa nitq hissələri üçün sözyaratma bazası kimi çıxış edir. Dialekt və şivələrimizdəki İran mənşəli sözlər əsasən konkret anlayış, predmet və hadisələri bildirir. Bunlardan əlavə əlamət və keyfiyyət bildirən sözlərə, zərflərə, modal sözlərə rast gəlmək olur. Şərq qrupu dialekt və şivələrinə İran dillərindən fel alınması müşahidə edilməmişdir, lakin Azərbaycan dilinin şəkilçiləri vasitəsilə alınma sözlərdən düzəltmə və mürəkkəb fellər düzəlir.

6.Tədqiq olunan dialekt və şivələrdə alınma sözlər fonetik-morfoloji cəhətdən olduğu kimi, leksik-semantik səviyyədə də müəyyən dəyişikliklərə məruz qalır. Lakin semantik dəyişikliklər fonetik dəyişikliklər kimi sistem xarakterli deyildir. İran mənşəli alınma sözlərin leksik-semantik xüsusiyyətlərinin təhlili göstərir ki, onlarda məna dəyişmələrinin 4 növü haqqında danışmaq olar: 1) mənanın saxlanması; 2) mənanın daralması; 3) mənanın genişlənməsi; 4) yeni məna kəsb etmə. Bu məna dəyişmələri həm tək, həm də çoxmənalı sözlərdə müşahidə olunmuşdur.

Alınma sözlərin əksəriyyəti özünün mənbə dildəki nominativ mənasında çıxış edən, konkret məfhumları bildirən leksik vahidlərdir. Belə sözlərdə semantik dəyişikliklər az nəzərə çarpır. Belə hal, fikrimizcə, sosial faktorla bağlıdır. Bu sosial faktor, yəni ikidillilik dialekt nümayəndələrinə imkan verir ki, daşıyıcıları

olduğu hər iki dildə sözlərin mənalarının eyniliyini nəzarət altında saxlasınlar.

Şərq qrupu dialekt və şivələrində işlənən İran mənşəli alınma sözlər 21 tematik bölgü üzrə qruplaşdırılır. «Məişətdə işlənən əşyaların adlarını bildirən söz və terminlər», «Yemək, içki, ağartı və s. ilə bağlı sözlər», «Kənd təsərrüfatında istifadə olunan alət və onların hissələrini bildirən söz və terminlər», «Ev, digər tikililər və onların hissələrinin adlarını bildirən sözlər», «Bitki adları», «Geyim, zinət və bəzək əşyalarının adlarını bildirən sözlər», «Quş adları» qruplarında sözlər daha üstünlük təşkil edir.

***Yanvar 1991-dekabr 1993***

# İXTİSARLAR

## Rayon və şəhər adları

**A.** – Astara
**Ab.** – Abşeron
**B.** – Bakı
**Br.** – Biləsuvar
**C.** – Cəlilabad
**ƏB.** – Əlibayramlı
**İ.** – İsmayıllı
**Q.** – Quba
**Lk.** – Lerik
**Ln.** – Lənkəran
**M.** – Masallı
**S.** – Sabirabad
**Sal.** – Salyan
**Ş.** – Şamaxı
**Y.** – Yardımlı

## Ədəbiyyat üzrə

**АДД** – Автореферат докторской диссертации
**АКД** – Автореферат кандидатской диссертации
**AFM** – Azərbaycan filologiyası məsələləri
**ВДТЯ**– Вопросы диалектологии тюркских языков
**СТ** – Советская тюркология

# LÜĞƏT

## A

| | |
|---|---|
| **Abqora** | qora suyu (Q.) |
| **Abqura** | bax: **Abqora** (Q.) |
| **Abi** | göy, mavi (B., Y.) |
| **Abxor** | su qabı, bardaq (S., Sal.) |
| **Abxur** | bax: **Abxor** (S., Sal.) |
| **Adna** | bax: **Adinə** (Ln., Sal., Ş., Y.) |
| **Adinə** | cümə axşamı; cümə (Ln., Sal., Ş., Y.) |
| **Adına** | bax: **Adinə** (Ln., Sal., Ş., Y.) |
| **Ambur** | kəlbətin (B.) |
| **Anqıl** | tor toxunan hana (Ln.) |
| **Ard** | unun tozu (İ.) |
| **Ardava** | undan hazırlanan yemək növü (Q.) |

## B

| | |
|---|---|
| **Bağala** | moruğ mürəbbəsi (Ş.) |
| **Bazi I** | hiylə, kələk (Ab.) |
| **Bazi II** | xışın kötüyünü boyunduruqla birləşdirən hissə (A., B., C.,Q., Lk., Ln., Sal., Ş.) |
| **Bazı** | bax: **Bazi II** |
| **Bazu I** | bax: **Bazi II** |
| **Bazu II** | bilərzik, qolbaq (İ.) |
| **Balaxana** | yayda istirahət üçün yer, külafirəngi (A., Ln., M.) |
| **Balbır** | suya batmamaq üçün tora bağlanan taxtalar (Sal.) |
| **Ban** | 1. dam (A., Br., C., M., Sal.,)<br>2. arabanın yük yeri (C.,M., Sal., Y.,)<br>3. baca, evin damınla açılan nəfəslik (Sal.) |
| **Banısdan** | Qoyun-quzu saxlanan yer (B., Ş.) |
| **Banıstan** | bax: **Banısdan** (B., Ş.) |
| **Bafa** | kiçik çəltik topası (əksər dialektlərdə) |

| | |
|---|---|
| **Bedləkər** | 1. çirkin ; 2. natəmiz (Ab., B.) |
| **Bekara** | yararsız, pis (Y.) |
| **Beybut** | qatlanmayan iri bıçaq (B.) |
| **Becə** | bax: **Bica** |
| **Beçəxor** | ana bətnində əmələ gələn xəstəlik (Ln.) |
| **Bəğəli** | moruğ (İ.) |
| **Bədsülik** | rəftarsız, pis rəftar edən (Ln.) |
| **Bələt** | həyət qapısı (C.,M.) |
| **Bəli** | bax: **Bəhli** |
| **Bəlləgilə** | palıd ağacının toxumu (A., Lk., Ln., M.) |
| **Bəndəm** | 1. meyvənin saplağı (Ab., B.)<br>2. dərz bağlamaq üçün otdan düzəldilən bağ (bütün dialektlərdə) |
| **Bəndəmə** | bax: **Bəndəm** |
| **Bəngi** | sözü yerinə yetirməyən (adam) (İ.) |
| **Bərbənd** | yorğan-döşək yığılan parça (B.) |
| **Bəsdi** | kiçik gil qab (Ab., Ln.) |
| **Bətdəmək** | bağlamaq, ötəri tikmək (Ab.) |
| **Bəhli** | gilas ( D., Q.) |
| **Bibikinə** | qoşu növü adı (Ln.) |
| **Bijən-bijən** | vurhavur ( Ln., M., Y.) |
| **Biyəndəcər** | çirkin, kifir (B.) |
| **Biləng** | yaba (M.) |
| **Bili** | ördək (Ln., M.) |
| **Biliqümə** | quş tutmaq üçün tor (Ln.) |
| **Biliqümələmək** | biliqümə ilə tutmaq (Ln.) |
| **Bin tutmaq** | 1. oturaq həyata keçmək ; 2. kök tutmaq (Y.) |
| **Binə** | 1. qaramal saxlanan yer ; 2. başlanğıc; bünövrə (Ab., B., Ln., Y.) |
| **Binəkə** | odun, kötük (Ln., M.) |
| **Binəkdar** | 1. əsaslı, özüllü (Ş.); 2. topdansatışla məşğul olan tacir (keçmişdə) (B.) |
| **Binişt olmaq** | məskən salmaq, oturaq olmaq (Y.) |
| **Biruni I** | yad, naməhrəm (Ş.) |
| **Biruni II** | bayır imarət (Б.) |
| **Biçizdik** | pulsuzluq (Б.) |
| **Bica** | nahaq, haqsız (C., B., Ln., Ş.) |

| | |
|---|---|
| **Bicar** | çəltik əkilən sahə (A., Ln., M.) |
| **Bicə** | bax: **Bica** |
| **Bili** | ördək balası (Sal.) |
| **Bır** | kol, tikanlı kol (C.,Ln., M.,) |
| **Boraşum** | bel ilə vurulan şum (A., C., Lk., Ln., M.,) |
| **Bozi** | bax: **Bazi II** |
| **Bul** | balıq ovunda istifadə olunan iki və ya üç dişli dəmir alət (Ln.) |
| **Bürgəz** | tikandan qayrılmış süpürgə (Sal.) |
| **Bürgöz** | bax: **Bürgəz** |
| **Bürüşdə** | qızarmış, yaxşı bişmiş (B.) |

## C

| | |
|---|---|
| **Cama** | sümük çıxıntısı (B.) |
| **Canbəsər** | canı boğaza yığılma (Y.) |
| **Canəzil** | xəstə, çox zəif (Ab.) |
| **Canəzir** | bax: **canəzil** (Y., Lk.) |
| **Canəzirlik** | naxoşluq, xəstəlik (Ş.) |
| **Car** | sığırçın (Ab.) |
| **Cəli** | tək, yalqız (S.) |
| **Cəlidə** | evsiz, ev-eşik qurmayan (Sal.) |
| **Cəməxodan** | yük yeri (İ.) |
| **Cəcü** | kirpi (Q.) |
| **Ciyə** | nazik kəndir (İ., Q., M., Y.) |
| **Ciyəvaz** | kəndirbaz (S.) |
| **Ciknə vermək** | qışqırmaq (C.) |
| **Cılandığ** | toyuğun çinədanı (Y.) |
| **Cır** | çürümüş süd (Ln., M.) |
| **Cu** | ləklərə gedən kiçik su yolu (Ab., B.) |
| **Cu birəxməğ** | şaiyə buraxmaq (Ab.) |
| **Cuvar** | suçu (Ab.) |
| **Cullab** | suda isladılmış quru meyvə (Ln.) |
| **Cumadar** | hamamda qulluq edən adam, kisəçi (Ab.) |
| **Cumaxatan** | yorğan-döşək yığılan taxça, yer (Ab., B.) |
| **Cü** | kiçik arx (Ln., Sal.) |
| **Cümbəcüş** | nadinc (Ln.) |

## Ç

| | |
|---|---|
| **Çayriz** | çay qabı (Ln., Ş.) |
| **Çarqat** | dördqat (B.) |
| **Çarxış** | yeri 4 dəfə şumlamaq (B.) |
| **Çeşnə** | günorta (Ln.) |
| **Çələgəndüm** | taxıl (Ab.) |
| **Çəm** | imkan (C.) |
| **Çəng** | dırmıq (B.) |
| **Çəngüri** | yağda qızardılmış kökə (Ln., M.) |
| **Çəp** | avar (Sal.) |
| **Çəpkeş** | avarçəkən (Ln., Sal.) |
| **Çəpləməg** | avar çəkmək (Sal.) |
| **Çərəydar** | qapançı, çəki ölçən adam (Y.) |
| **Çərək** | ölçü vahidi (Y., Ln.) |
| **Çərgül** | dördkünc (Ş.) |
| **Çərəngülə** | çərçivə (İ., S.) |
| **Çərgov** | qoşçu heyvanlarının 1-ci cütü (Ş.) |
| **Çəsbənd** | zirək, cəld (Q.) |
| **Çəşpilə** | gözün altının şişməsi (Ln.) |
| **Çiben** | asmalıq (Ln., M.) |
| **Çiləmərdə** | eyvanın altına vurulan ağac (Ln.) |
| **Çiləmərzə** | bax: **çiləmərdə** (Ln.) |
| **Çin** | oraq (C.,Q., Ln., M., Sal.) |
| **Çinətgan** | çinədan (Br.) |
| **Çirkəsüt** | çox çirkli (Ln.) |
| **Çona** | kiçik çala (Sal.) |
| **Çülə** | çöp (C., Ln., M., Y.) |
| **Çüpə** | kol (Y.) |
| **Çüpəlig** | kolluq (Y.) |

## D

| | |
|---|---|
| **Dağbəsər** | dağüstü (B.) |
| **Dala** | qamışın bir növü (Ln., S., Sal.) |

| | |
|---|---|
| **Daləngəvaz** | yöndəmsiz (Q.) |
| **Damad** | kürəkən (Q.) |
| **Daməd** | bax: **Damad** |
| **Dambıl** | gavalı növü (A., B., Ln., Sal.) |
| **Dammılı** | bax: **Dambıl** (A., B. ) |
| **Dancə** | bax: **Dancənə** (Ln.) |
| **Dancənə** | doğramac (Ln.) |
| **Darasar** | qapı və pəncərə üstünə atılan taxtalar (A., Ln., M.) |
| **Darosər** | bax: **Darasar** (A., Ln., M.) |
| **Dasdar** | əl dəyirmanı (A., C., Q., Ln.) |
| **Dasdana** | təndir çörəyi (Ab.) |
| **Dasəçin** | 1. ağacdan əllə meyvə dərmə ; 2. əllə dərilən seçmə meyvə (Ln.) |
| **Dassar** | bax: **Dasdar** (A., C., Q., Ln.) |
| **Dastək** | qulluğa gedə bilən uşaq (A.) |
| **Dahar I** | «qayalıq, daşlıq (Ab., B., Q.) |
| **Dahar II** | «ətirli bitki (Y., Ln.) |
| **Daharrığ** | təpəlik (B.) |
| **Desbiri** | kimi, tək, oxşar (B.) |
| **Desde-fərman** | əlaltı (Ab.) |
| **Destab** | plovu süzmək üçün götürülən qaynar su (Ab.) |
| **Destə** | bax: **dastək** (Ab.) |
| **Destənə** | qolbaq (Ab.) |
| **Deşdavar** | qərb küləyi (L., Ln., Sal.) |
| **Dəyek** | köhnə vergi adı (Ab.) |
| **Dəhər** | bax: **Dahar II** (Y., Ln.) |
| **Dəhmərdə** | saxsı dərin boşqab (B., ƏB., Ln., S.) |
| **Dəgə** | koma (Ab.) |
| **Dələ** | bax: **Dala** |
| **Dələngəvaz** | kobud (Q., S.) |
| **Dəməndə** | əliboş, köməksiz (Y.) |
| **Dəmərdə** | bax: **Dəhmərdə** (B., ƏB., Ln., S.) |
| **Dəmkeş** | qazan, samovar və s. ağzına qoyulan mis qapaq (bütün dialekt və şivələrdə) |
| **Dəndə** | araba təkərinin barmaqlıqları (B., Q., Ln.) |
| **Dəngənə** | saxsı boşqab (Q., Ln., Ş.) |

